DOI: https://www.doi.org/10.36719/2663-4619/68/7-11

**Mahir Həmzə oğlu Hacıyev**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
aqrar elmlər üzrə fəlsəfə doktoru, dosent
**Vəfa İbrahim qızı Məhərrəmova**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
böyük elmi işçi
maharramovavefa0@gmail.com

# YENİ YARADILMIŞ MÜXTƏLİF PLOİDLİ TUT SORTLARININ YEMLİK KEYFİYYƏTİNİN VƏ SORTSINAQ YEMLƏMƏSİNİN BİOLOJİ GÖSTƏRİCİLƏRİNİN ÖYRƏNİLMƏSİ

***Açar sözlər:*** *Tut, sort, yarpaq məhsuldarlığı, ipəklilik, yaşama qabiliyyəti, baramanın orta kütləsi, ipəklilik , barama məhsulu*

## Study of feed quality and biological indicators of varietal feeding of newly created different ploidy mulberry varieties

**Summary**

The article clarifies the effect of the leaves of various newly created ploidy mulberry varieties on the productivity of mulberry silkworms, as well as on the biological parameters of silkworms.

New varieties are described by conducting varietal feeding to determine the feed quality of varieties by providing information on leaf yield and the leaf yield of newly created varieties, by studying the biological parameters of varietal feeding, by determining the average mass of alive cocoons, silkness%, cocoon yield.

***Keywords:*** *mulberry, sort, leaf yield, silkiness, viability, average weight of cocoon, cocoon product*

Kənd təsərrüfatının qədim və gəlirli sahələrindən biri də ipəkçilikdir. Yaxşı məlumdur ki, baramadan alınan bütün məhsullardan istifadə olunur, demək olar ki, barama tulantısız məhsul hesab olunur. Barama pupundan balqçılıqda, quşçuluqda istifadə olunur. Pup ununun tərkibində olan zülaların 55-70% asan həzm olunandır, 20-25% yağ mənşəyinə görə doymamış yağlardan ibarətdir. Məhsul biokimyəvi tərkibinə görə balıq unu kimi qiymətli xammaldan daha üstündür. (9, 52)

İpəkçiliyin inkişafı isə onun yem bazasından əhəmiyyətli dərəcədə asılıdır. Çünki tut yarpağı tut ipəkqurdu üçün yeganə və əsasən əvəzedilməz yem sayılır. Tut ipəkqurdları qidalanan zaman orqanizm üçün lazım olan zülalları, yağları, karbohidratları və digər qida maddələrini yalnız tut yarpağından mənimsəyirlər. (4,13-16) Deməli, tut yarpağının yemlik keyfiyyətini, məhsuldarlığını şərtləndirən əsas göstəricilərdən biri, onun tərkibində olan kimyəvi maddələr və onların mənimsənilmə dərəcəsidir. Onu da qeyd etmək lazımdır ki, elmi ədəbiyyatlarda çoxsaylı məlumatlar vardır ki, yarpağın kimyəvi tərkibi tutun sort xüsusiyyətindən, ploidlikdən, bitdiyi yerdən, yarpağın və ağacın yaşından, aqrotexniki qulluqdan, hava şəraitindən, torpağın tipindən, yarpağın dərilmə vaxtından və mövsümündən, çətirin formasından, plantasiyanın tipindən və s. asılı olaraq əhəmiyyətli dərəcədə dəyişir ki, bu da ipəkqurdunun bioloji və təsərrüfat göstəricilərinə ciddi təsir göstərir (2,43-46).

Məqalədə yeni yaradılmış müxtəlif ploidli tut sortları yarpağının tut ipəkqurdunun məhsuldarlıq göstəricilərinə, eləcədə ipəkqurdunun bioloji gösdəricilərinə təsiri aydınlaşdırılır.

Tut ipəkqurdlarının V yaşının 5-6-cı günlərində sınaqdan keçirilən sortların hər birindən 3 təkrarda və hər təkrarda 5 model ağacda yarpaq məhsuldarlığının uçotu aparılmış və eyni zamanda yarpaq məhsuldarlığının struktur elementləri öyrənilərkən yarpaq çıxımı təyin edilmişdir.

Cədvəldən görünür ki, yarpaq çıxımı sortların irsi xüsusiyyətindən asılı olaraq müxtəlif olmuşdur. Dörd il ərzində öyrənilən yarpaq məhsuldarlığının orta göstəricisi müəyyənləşdirilmiş, alınan nəticələr birinci cədvəldə verilmişdir.Yarpaq məhsuldarlığı riyazi üsulla hesablanmışdır.[7,335]

**Cədvəl 1**

**Sınaqdan keçirilən sortların yarpaq məhsuldarlığı**
**(4 ildən orta hesabla)**

| Sortların adı | Ploid-liyi | Yarpaq çıxımı, % | Yarpaq məhsuldarlığı | | | Kontrola görə, %-lə |
|---|---|---|---|---|---|---|
| | | | Kq/ağac | | S/ha | |
| | | | X | +Sx | X | |
| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 |
| S9-3 | 3x | 52,19 | 4,46 | 0,64 | 55,76 | 118,18 |
| S9-5 | 3x | 50,45 | 4,69 | 0,60 | 58,59 | 124,18 |
| S9-7 | 4x | 52,55 | 5,30 | 0,70 | 66,22 | 140,35 |
| S9-12 | 2x | 50,20 | 3,79 | 0,47 | 47,34 | 100,34 |
| Gözəl (kontrol) | 2x | 53,12 | 3,77 | 0,48 | 47,18 | 100,00 |

2011-2015- ci illərdə müxtəlif ploidli tut sortlarından və formalarından yarpaq məhsuldarlığına görə fərqlənən və nəzarət Gözəl tut sortunu ötən sortlar üzərində onların yem keyfiyyətini öyrənmək üçün yemsınaq yemləmələri aparılmışdır.

Yarpaq məhsuldarlığına görə kontrol sortdan nisbətən yaxşı fərqlənən sortların yemlik keyfiyyətini öyrənmək məqsədilə S9-3, S9-5, S9-7 və S9-12 sortlarının kontrol Gözəl-tut sortu ilə yanaşı yemsınaq yemləməsi Gəncə-6 x Yaşar hibridinin qurdları ilə əsasən ümumi metodikaya uyğun aparılmış, yemləmənin bioloji göstəriciləri müəyyən edilmiş və nəticələr 2-ci cədvəldə verilmişdir. Yemləmə dövründə kümxanada normal istilik və rütubət yaratmaq mümkün olmuş, yem də vaxtında verilmiş və keyfiyyətli yarpaqdan istifadə edilmişdir. Yemləmə zamanı bütün variantlara lazımi aqrozootexniki qulluq göstərilmişdir.

Belə ki, qurdların yaşama qabiliyyəti variantlardan asılı olaraq 2 ildən orta hesabla 40.16 -51.66% arasında dəyişmişdir. Ən aşağı yaşama qabiliyyəti S9-7 variantında (40.16) nisbətən yüksək yaşama qabiliyyəti S9-5 variantında (52.33) olmuşdur. Kontrol Gözəl-tut variantında isə bu göstərici (47.83) olmuşdur. Barama məhsuldarlığına təsir edən göstəricilərdən biri də diri baramanın orta kütləsidir. Cədvəl 2-dən göründüyü kimi yarpağın çəki ilə verildiyi şəraitdə çox yaxşı nəticə alınmış və bu göstərici variantlardan asılı olaraq orta hesabla 1.92-2.03 arasında dəyişmiş, kontrol Gözəl-tutda isə 2.02qr təşkil etmişdir.Diri baramanın ipəkliliyinə görə də variantlar arasında müəyyən fərqlər müşahidə edilmişdir. Belə ki, təcrübə variantlarında bu göstərici 17.85-19.23% arasında dəyişmiş,

kontrol variantda isə 18.90 olmuşdur . Beləliklə də yeaydın olmuşdyr ki, yeni yaradılmış sortlar bir çox hallarda yemləmənin bioloji göstəricilərinin yaxşılaşması ilə fərqlənmişlər.

**Cədvəl 2**

**Sortsınaq yemləməsinin bioloji göstəriciləri**
**(2 ildən orta )**

| Variantlar | Yemləmə müddəti, sutka, saat | Qurdların yaşama qabiliyyəti, % | D i r i b a r a m a n ı n | |
|---|---|---|---|---|
| | | | Orta kütləsi, qr | İpəkliliyi, % |
| S9-3 | 28,22 | 44,50 | 1,92 | 18,04 |
| S9-5 | 28,22 | 52,33 | 2,032 | 17,85 |
| S9-7 | 28,22 | 40,16 | 1,94 | 18,01 |
| S9-12 | 28,22 | 51,66 | 2,02 | 19,23 |
| Gözəl-tut (kontrol) | 28,22 | 47,83 | 2,02 | 18,90 |

Sınaqdan keçirilən sortlara qiymət vermək üçün məhsuldarlıq göstəriciləri də öyrənilmiş və həm 100 ədəd, həm bir qram həm də bir qutu qurddan alınmış barama məhsylu müəyyən edilmiş və nəticələr 3-cü cədvəldə verilmişdir. Eyni hibridin eyni gündə çıxmış qurdları müxtəlif sortların yarpaqları ilə yemləndirilmiş və odur ki, bütün göstəricilər üzrə alınmış fərqlər ilk növbədə yemin təsiri ilə izah edilməlidir. Göründüyü kimi yarpağın yemlik keyfiyyəti hər üç dəyərli göstəriciyə əhəmiyyətli dərəcədə təsir etmişdir. Belə ki, təcrübə variantlarında 100 qurddan alınan barama məhsulu 2 ildən orta hesabla isə 77,47-106,71 qr arasında dəyişmiş, kontrol variantda isə 88,49 -110,54 qr arasında dəyişmişdir. Müəyyən edilmişdir ki, yemləndirilən hibridin qurdlarının sayı 1 qr-da 2600 ədəd olmuşdur. Bu göstəricidən istifadə etməklə 1 qr qurddan alınan barama məhsulu müəyyən edilmiş və nəticələr cədvəldə verilmişdir. Eyni zamanda bir qutu qurddan (standart qutu 19,0 qr götürülür) alınan barama məhsulu da hesablanmış və nəticələr 3-cü cədvələ daxil edilmişdir. Təcrübə variantlarında 1qr qurddan 2 ildən orta hesabla 2,02-2,77 kq, kontrol variantda isə 88,45-110,36 kq olmuşdur.

Bütün şərtlərin əsasən eyni olduğu halda əldə edilmiş fərqlərin sortun yemlik keyfiyyətindən asılı olduğunu söyləmək olar. Sınaqdan keçirilən sortlar üzrə bir qutu qurddan alınan barama məhsulu da hesablanmış və aydın olmuşdur ki, bu göstərici təcrübə variantlarında 2 ildən orta hesabla isə 38,28-52,63 kq arasında dəyişmiş, kontrol variantda isə 88,45-110,36 kq olmuşdur. Göründüyü kimi S9-5 və S9-12 sortları bu göstəriciyə görə kontrolu 2 ildən orta hesabla 8,55-10,36% arasında ötmüşlər, S9-3 və S9-7 sortlrı isə xeyli geri qalmışlar. Burada onu da qeyd etmək yerinə düşər ki, Azərbaycan SSR-də 1 qutudan barama məhsulu orta hesabla 45 kq təşkil edirdi. Deməli əlverişsiz yemləmə şəraitində belə S9-5, S9-12 və Gözəl-tut sortları qənaətbəxş nəticələr göstərmişlər ki, bu da gələcək rayonlaşdırma üçün yeni sortların seçiləcəyinə tam imkan verəcəkdir.

**Cədvəl 3**

**100 əd, 1 qr və 1 qutu qurddan barama məhsulu**

| S.s. | Variantlar | 100 qurddan, qr-la | | 1 qr qurddan, kq-la | | 1 qutudan, kq-la | |
|---|---|---|---|---|---|---|---|
| | | 2 ildən orta | Kontrola görə %-lə | 2 ildən orta | Kontrola görə %-lə | 2 ildən orta | Kontrola görə %-lə |

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| 1 | S9-3 | 85,42 | 88,49 | 2,22 | 88,45 | 42,18 | 88,45 |
| 2 | S9-5 | 106,71 | 110,54 | 2,77 | 110,36 | 52,63 | 110,36 |
| 3 | S9-7 | 77,47 | 80,25 | 2,02 | 80,48 | 38,28 | 80,95 |
| 4 | S9-12 | 104,82 | 105,78 | 2,72 | 108,37 | 51,77 | 108,55 |
| 5 | Gözəl-tut (kontrol) | 96,53 | 100,00 | 100,00 | 49,40 | 100,00 | - |

**QEYD:** 1 qr-da 2600 əd. Qurd olmuşdur. 1 qutuda isə 19 qr qurd olduğu qəbul edilmişdir

Yeni yüksək məhsuldar tut sortları yaratmaq məqsədilə ilkin seleksiya materialı yetişdirmək üçün növdaxili, növarası istiqamətli hibridləşdirmənin, təbii tozlanmanın və elecə də poliploidiyanın imkanlarından gələcəkdə də geniş şəkildə istifadə etmək olar, eləcədə seleksiyanın müxtəlif mərhələlərində öyrənilən bitkilər içərisində müxtəlif irsi imkanlara malik formalar vardir ki, onlardan da istifadə etməklə daha məhsuldar tut sortları yaratmaq işi fasiləsiz şəkildə davam etdirilməlidir.(6,24-32)

Göstəricilərinə görə yaxşı fərqlənən S9-5 və S9-7 sortları gələcək sınaq və rayonlaşdırma məqsədilə “Seleksiya nailiyyətlərinin mühafizəsi və sınağı üzrə Dövlət komissiyasına təqdim etmək üçün məsləhət görülür.

Yeni yaradılmış sortların botaniki təsviri:

**(sinonim S9-5) forma Sp1-38/75**

Sort Gözəl-tut (2x) x 1-6/70 (4x) hibrid kombinasiyasından alınmış bitkilər içərisindən fərdi seçmə yolu ilə yaradılmışdır, *M.Kaqayamae Koidz*. x *M.Kaqayamae Koidz.* növünün növdaxili hibrididir, triploiddir, somatik hüceyrələrində 2n=3x=42 xromosom vardır. Birevlidir, ikicinslidir, erkək çiçəklər və eləcə də meyvə əmələ gətirir, meyvəverməsi zəifdir. Gövdənin qabığının rəngi tünd bozdur. Çətiri dairəvi qollu-budaqlıdır. Budaqları düzdurandır, yan budaqlar əmələ gətirmir. Birillik budaqların rəngi qonur bozdur, mərciməklər sayı 1 kv.sm-də 6,7 ədəddir. Tumurcuqları üçbucaq formasındadır, qonur qəhvəyi rəngdədir, budağa yatandır, ölçüləri 0,6 x 0,4 sm olmaqla kip yapışan 3-4 əd pulcuqla örtülmüşdür. Birillik budaqların uzunluğu 146,9 sm, buğumarasının uzunluğu 4,46 sm, 81,02% məhsuldar zoğlar əmələ gətirir, boyatan zoğların yarpaqlanması 6,9 əd., boyatmayan zoğlarınkı isə 2,9 əd, bir yarpağın kütləsi boyatan zoğlarda 4,6 qr; boyatmayan zoğlarda 3,1 qr-dır.

Yarpaq ayası bütövdür, orta böyüklükdədir, boyatan zoğlarda 19,3 x 14,7 sm-dir, ürəkvari formalıdır. Yarpağın rəngi tünd yaşıldır, səthi sığallıdır, hamardır, parlaqdır, damarlanması ortadır, tüklülüyü zəifdir, yalnız damarların künclərində rast gəlir, konsistensiya orta zərifdir, yarpağın ucu (təpəsi) orta sivridir, kənarı dişvaridir, əsası zəif olmalıdır. Saplağı 5,3 sm, yumru, orta novalçalı, açıq yaşıldır. Yarpağın duruşu adi maili şəkildədir. Filotaksis (ortasız) 2/5-dir. Şaxtaya davamlılığı ortadır, yüksək gövdəli plantasiyada 5-7 illik bir ağacdan məhsuldarlıq 4,69 kq, 4x2 m sıxlıqda isə 58,59 s/ha-dır.

**(sinonim S9-7) forma Sp2-27/36**

Sıxgöz-tut (4x) x Yaqub-tut (4x) hibrid kombinasiyasından alınmış hibrid birkilər içərisindən fərdi seçmə yolu ilə yaradılmışdır və *(M.multicaylis Perr. X M.bombycis Koidz.)*

*x M.alba L.* növlərinin növarası hibrididir, tetraploiddir, somatik hüceyrələrində 2n=4x=56 xromosom vardır. İkievlidir, bircinslidir, dişidir, meyvə verməsi azdır. Gövdənin qabığının rəngi açıq bozdur, çətiri süpürgə şəkillidir, budaqları düzdurandır, yuxarı hissədə azca əyilir, yan budaqlar əmələ gətirmir.

Birillik budaqların rəngi açıq qonurdur, mərciməklərin sayı bir kv.sm-də 6,0 ədəddir. Tumurcuqları üçbucaq formasındadır, açıq şabalıdı rəngdədir, budağa yatandır, ölçüləri 3,6 x 4,4 mm, pulcuqların sayı 4,4 ədəddir, kip yapışırlar. Birillik budaqların uzunluğu 132,8 sm, buğumarasının uzunluğu 4,47 sm, məhsuldar zoğlar 71,97%-dir. Boyatan zoğların yarpaqlanması 10,4 əd, boyatmayan zoğlarındakı isə 3,0 əd, bir yarpağın kütləsi boyatan zoğlarda 6,2 qr, boyatmayan zoğlarda 3,0 qr-dır. Yarpaq ayası bütövdür, forması ürəkvaridir, orta böyülükdədir, boyatan zoölarda 17,9 x 14,7 sm-dir, üst səthi qabarıqdır, kənarları xırda dişvaridir, orta qalınlıqdadır, açıq yaşıl rəngdədir, uc hissəsi genişdir, əsası zəif olmalıdır, damarlanması ortadır, tüklülüyü zəifdir, yalnız damarların künclərində rast gəlinir,konsistensiyası elastiki, ortostix 2/4-dir. Yarpaqlar zoğ üzərində maili durur, yarpaq saplağı sarımtıl yaşıl rəngdədir, novalçası dayazdır, forması yumrudur, ölçüsü 5,6 sm-dir.

Şaxtaya davamlılığı ortadır, yüksəkgövdəli plantasiyada 5-8 iilik ağacların orta məhsuldarlığı bir ağacdan 5,30 kq, 4x2 əkin sıxlığında isə 66,22 s/ha-dır.

## References


1. Horticulture.Mulberry cultivation. Ankara, 2013
2. Sadikhov A.H., Maharramova V.I. Study of productivity of newly created mulberry varieties. AzNSA, Ganja RSC, “News”collection № 47, 2012, p.43-46.
3. Abbasov B.H., Hasanov M.M., Hasanova E.M. – Studying the effect of the amount of the feed given to adults on the productive and reproductive performance of mulberry silkworms // Works of AzSRIS -2004. Volume XVI, p.42-46
4. Akbarov Z.I. Prospects for the collection, protection and research of genetic resources.Genetic resources of biodiversity. Materials of the international scientific conference. Baku, 2006, pp.13-16
5. Maria Ichim, Panomir Tzenov, Dimitar Grekov, Krasimira Avramova-Mulbery Plantation Establishement Methods, Suitable for Europe,Caucasus and Central Asia. 9th BACSA International Conference “Sericulture preservation and revival –problems and prospect” “SERIVIVAL” 2019
6. Sadikhov A.H., Alakbarova O.R., Maharramova V.I., Mustafayeva E.F. Study of biomorphological features of newly created mulberry varieries.”News” of AzSRIS №1,XVII volume, Ganja-2010. pages 24-32.
7. Dospekhov B.A. Methods of field experience, Moscow, Publishing h.”Colossus, 1968, 335 p.
8. Erkaleli, Z.Ö., 2015.Determination of Morphological, Phenological and Pomological Features of Blackberries (Morus nigra L.) Growing up in UşakİIi Ulubey District, Adnan Menderes University, Institute of Science, Texas, Garden Plants, Anabil.
9. http://www.academicresearchjournals.org/ARJASR/Index.htm


Göndərilib: 07.07.2021 Qəbul edilib: 17.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/12-19

**Əli Umud oğlu Əliyev**
ADPU Ağcabədi filialı
filologiya üzrə fəlsəfə doktoru, baş müəllim
eli.eliyev.54@mail.ru

# "HƏR OXUYAN MOLLA, PƏNAH OLMAZ!"

***Açar sözlər*:** *Hər oxuyan, molla, Pənah, Vaqif, milli şair, xəlqi, Şuşa, Saatlı məhəlləsi, İbrahimxəlil xan, Musa Kəlimullah, Əli Gəlibəri, Turan dünyası*

> "Böyük şairimiz Molla Pənah Vaqif XVIII əsrdə şeir dilini xalq dilinə daha da yaxınlaşdırdı. Onun yazdığı şeirləri xalqın bütün təbəqələri həm anlaya, həm də qavraya bildi, həm də sevdi. Beləliklə, o, Azərbaycan şeirində yeni bir yol açdı".
>
> **Heydər Əliyev**

## Each reader is not Mollah Panah

**Summary**

The strength of poetry by Mollah Panah Vagif is not only for the closeness to the people, or for nationality and the sweetness of language style, but also for universal characteristic features. Mollah Panah Vagif is one of the outstanding persons who has great value both in his living period, next centuries and nowadays too. His literary works are not only the beginning of Renaissance period of our national poetry, but also founded the basis of new literary school having a talent of showing reality. Mollah Panah Vagif's literary works play a lighthouse role for his followers. This literary school was the realism of our national-people poetry. This reality is our today's victory for our motherland. When we watch Mollah Panah Vagif's literary works through the mirror of XXI century, we can see that he has been risen to the peak of modernity of poetic talent. The main fact of this peak is Vagif's realism, his universal feelings, his accuracy and being laconic. Reflecting deep meanings with few words by poet is the basis of this work. That is the obvious example of the poet's high talent.
***Key words:*** *each reader, mollah, Panah, Vagif, national poet, people, Shushah, Saatli estates, Ibrahimkhalil khan, Musah Kalimullah, Ali Galibari, Turan world*

**Mövzunun aktuallıq kəsb etməsi** 2020-ci il, noyabrın 8-də Şuşanın erməni işğalından azad olunması və Prezidentimizin Şuşada "Vaqif şeir günü"nün keçirilməsi haqqında verdiyi tapşırığa uyğun bir daha bu mövzuya müraciət etməyi şərtləndirir. Həmçinin Vaqif elə bir ədəbi məktəb yaratmışdır ki, o məktəb daim öz aktuallığını qoruyub saxlayır və saxlayacaqdır.

Bu günümüzə qədər Molla Pənah Vaqif haqqında yuxarıda söylənmiş xalq kəlamı, zərbi-məsəli yanlış olaraq "Hər oxuyan, Molla Pənah olmaz" şəklində işlənmişdir. Diqqət yetirsək bu məsəldə "hər oxuyandan" deyil, "hər oxuyan molladan" söhbət gedir. Çünki Vaqif dövründə bir çox mollalar mədrəsələr açmış, din dərsləri tədris etmişlər və molla olaraq qalmışlar. Vaqif də molla olmuşdur. O, Şuşa şəhərində Saatlı məhəlləsində mədrəsə açmış və tədris işləri ilə məşğul olmuşdur. Ona görə də xalq ona "Molla" titulu vermişdir, amma Vaqif təkcə mollalıqla məşğul olmamış, şair-diplomat olmuş, xanın vəziri vəzifəsinə qədər yüksəlmişdir. Xalq ona Vaqif təxəllüsünü vermişdir. Vaqif hər şeyi bilən, hər şeyə vaqif

olan deməkdir ki, bu da şairin öz dövrünün mütəfəkkiri olduğunu təsdiq edir. Onun yaradıcılığında olan nikbinlik, gözüaçıqlıq, gürçəklik və həyata realist baxış Vaqifin ictimai-siyasi fəaliyyətində də əsas rol oynamışdır. Odur ki, xalq "Hər oxuyan molla, Pənah olmaz!" kəlamını işlətmişdir.

Həsən İxfa Əlizadə "Şuşa şəhərinin tarixi" əsərində Şuşanın mədəni həyatı və tarixi abidələri haqqında bölümündə yazmışdır: "XVIII əsrin ikinci yarısından başlayaraq Şuşa şəhəri Azərbaycan mədəniyyəti, ədəbiyyat və incəsənətinin mühüm mərkəzlərindən biri olmuşdur. Şübhə yoxdur ki, bu işin möhkəm təməlini İbrahim xanın vəziri Molla Pənah Vaqif qoymuşdur. O da məlumdur ki, Vaqif Şuşada fəaliyyətə Saatlı məhləsində açdığı mədrəsə ilə başlamışdır. Vaqifin böyük ədəbi məktəb yaratdığı, onlarla davamçılar yetirdiyi oxuculara yaxşı məlumdur.... Molla Pənah Vaqif Şuşa mühitində nəşvi-nüma tapmışdır. Qazax mahalında doğulsa da, Vaqifin dünyagörüşü, yaradıcılıq tərəqqisi Şuşada zirvəyə çatmışdır və "Hər oxuyan molla, Pənah olmaz" zərbi-məsəli, ən yüksək ad və qiymətə Şuşa mühitində yüksəlmişdir. Şuşanın Vaqifləri, Zakirləri, Asiləri, Natəvanları, Aşıq Pəriləri, Kəminələri, Nəvvabları yetişmişdir." (Qarabağnamələr, 1991: s. 311 və 341).

Elə zənn olunur ki, Molla Pənah Vaqif Şuşada xan sarayında ilk şair olmuşdur. Əslində Vaqif Musa Kəlimullahdan sonra saraya gəlmişdir. Odur ki, izi qalmış, sözü qalmış, amma bizə barəsində az məlumat çatan Qarabağ ədəbi mühitinin nümayəndələrindən biri də Kəlimüllah Musadır. Şair Kəlimüllah Musa haqqında çox az məlumat vardır. O, təxminən XVIII əsrdə yaşamışdır. Ibrahimxəlil xanın sarayında şairlik etmişdir. Molla Pənah Vaqifdən əvvəl sarayda olmuşdur. Molla Pənah Vaqif Ibrahimxəlil xana yazdığı fəxriyyədə onu belə xatırladır:

Qarabağ içrə bir şair Kəlimüllahi- Musadır,
Cavanşir içrə bir mövzun bayati dəsti-beyzadır.
(Mir Mhsün Nəvvab, 1989: s. 15)

Buradan aydın olur ki, İbrahimxəlil xanın sarayının ilk şairi Kəlimüllah Musa olmuşdur və Qarabağda "Bayatı janrı" əsas mövqeyə malik olmuş və çox işlək janr olmuşdur.

Kəliullah Musanın saraya gəlməsi barədə xalq arasında belə bir deyim yaşanır. Söyləyirlər ki, İbrahimxəlil xan hazırcavab və şeir yazan adamları xoşlayırmış. Odur ki, İbrahimxəlil xan bir gün Kəlimullah Musanı nahar vaxtı yanına dəvət edir və deyir:

"Kəlim, ( Kəlimüllahı xan belə çağırarmış) yeməklər içərisində nə yeməli? " cavabında Kəlimüllah deyir ki, xan sağ olsun, yumurta. Xan ona heç bir söz demir və onu azad buraxır. Bir il keçdikdən sonra xan onu yenə çağırtdırır və deyir:

" Kəlim nə ilə? "

- Xanım, duz ilə.

- Bəs niyə yumurta?

- Xanım, çünki o zaman nahar vaxtı idi, əlinizdə yumurta tutmuşdunuz, nağdını qoyub nisyə dalınca qaçmazlar, odur ki, ortada olana sığındım.

Belə bir sual-cavabdan sonra xan onu saraya dəvət edir. Mollə Pənah Vaqif saraya gələnə kimi o, sarayda fəaliyyət göstərmişdir. Onun yaradıcılığı itib-batmışdır. Bir qoşmasını Həsən İxfa Əlizadə ( 1893-1972 ) " Şuşa şəhərinin tarixi " əsərində qələmə almışdır:

Zalım fələk, sənə netdim neylədim?!
Əcəl qılıncları çalhaçaldadır.
Hansı halalını haram eylədim?!
Bəlasız başımız qalmaqaldadır.

Şirvanlı Çələbi döyülüb qaçdı,
Qacar Məmmədhəsən bir oyun açdı,
Ovşar Fətəli də yolunu çaşdı,
Indi başqa fikir başqa haldadır.

Qızmış şirə döndü Ağamməd Qacar,
Qarabağa gətdi qanlı bir azar,
O saymadı, bax, gör fələk nə sayar,
Leşi gorda, başı bizim yoldadır.

Yasa döndü bütün toylar-düyünlər,
Ələ düşdü nazlı qızlar-gəlinlər,
Ləkələndi ismət, namus yeminlər,
Bu cəza nə yerdə, nə mahaldadır.
(Qarabağnamələr, 1991: s. 341)

O dövrün ictimai-siyasi durumunu əks etdirən, tarixin yaddaş səlnaməsi kimi əsrlərdən keçərək bu gün səslənən bu mükəmməl şeir nümunəsi Kəlimüllah Musanın püxtələşmiş bir şair olduğunu sübut edir. Həmçinin bu şeirdən bəlli olur ki, 1797-ci ildə Kəlimüllah Musa yaşayırmış.

Molla Pənah Vaqifin də saraya getməsi haqqında xalq deyimləri mövcuddur. Bu deyimləri toplayıb nəşr etdirən Kamran Məmmədov "Yazıçıların həyatından dəqiqələr" kitabında Vaqifin saraya gəlməsi barədə dörd rəvayəti qələmə almışdır. Bu rəvayətlərdən ikisinin önəmli olduğunu nəzərə alıb qeyd edirəm: "Vaqif Tərtərbasardan Şuşaya gəlir. Şəhərin Saatlı məhəlləsində məktəb açır. Öz savadı və uzaqgörənliyi, şirin şeirləri ilə tez zamanda ətrafdakıların hörmətini qazanır.

Novruz bayramı günü münasibətilə şairin yazdığı məşhur "Bayram oldu" şeiri əl-əl gəzib, axırda gedib İbrahim xana çatır. Xan onun hazırcavab, zirək və tezfəhm olduğunu görüb saraya dəvət edir".( Kamran Məmmədov, 1970: s. 29).

Məncə, "Bayram oldu" şeirini burada xatırlatmaq və oxucuların diqqətinə çatdırmaq onun məna gücünü bir daha dəyərləndirməkdir:

Bayram oldu heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdur.
Dügilə yağ çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm, dəxi qoymazlar kəndə,
Xalq batıbdır noğla, şəkərə, qəndə,
Bizim evdə axta-zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə də evdə sahibcamalımız var,
Vaqif, öyünmə ki, kamalımız var,
Allaha şükür ki, kamal da yoxdur.
(Mirzə Yusif Qarabaği, 1999: s. 14).

Vaqifin saraya gəlməsi barədə söylənən başqa bir rəvayətdə isə belə söylənilir: “Vaqif Şuşada bir çox adamlarla yaxınlıq edib, ülfət qılırmış. Onlardan biri də İbrahim xanın yaxın adamı, sarayda mötəbər şəxs Mirzə Vəli Baharlı imiş. Vaqif ayın tutulmasını və zəlzələni qabaqcadan xəbər verərkən onun ağlına heyran qalmış, Baharlı bu əhvalatı İbrahim xana danışır. İbrahim xan Vaqiflə şəxsən görüşüb, onun kamalını qiymətləndirir, saraya gətirdir”. (Kamran Məmmədov, 1970: s. 29).

Molla Pənah Vaqifin poetik yaradıcılığı sağlığında da sevilib, yüksək dəyər qazanmışdır. Aşıq Əli Gəlibərinin Molla Pənah Vaqifə “ey alicənab” deyə müraciətlə yazdığı “Gəlmiş” adlı şeiri mənbələrdə özünə geniş yer almışdır:

Bu gövhər sözlərin, ey alicənab,
Tamam aşiqlərin şəninə gəlmiş.
Fəsahətdə, bəlağətdə sənin tək,
İnanma ki, ruyi-zəminə gəlmiş.

Bu əsrdə şairlərin xanisən,
Müddərisə bərabərsən yəni sən.
Elmin mədənisən, gövhər kanisən,
Eşidənlər sözün dəminə gəlmiş.
(Firudun bəy Köçərli, 1978: s. 22).

Belə müraciətlər XVIII əsrdə ənənəviliklə nəzərə çarpır və təkcə Molla Pənah Vaqiflə digər müasirləri arasında fikirlərini bölüşmə, hiss və duyğularını ifadə etmək xarakteri daşımır. Eyni zamanda onların həyatının bəzi məqamlarını özündə yaşatmaq xüsusiyyəti ilə dəyər kəsb edir. Məhz yuxarıdakı nümunədə də bu hal özünü aydınlıqla göstərir. Aşıq Əli Gəlibəri bu şeirilə Molla Pənah Vaqifin XVIII əsr Qarabağ ədəbi mühitində, eləcə də Azərbaycan poetik düşüncəsində yerini çox dəqiq ifadə edir. Xüsusi olaraq XVIII əsrdə şairlərin xanı kimi ad qazanmasını, müddərisə bərabərliyini, elmin mədəni, gövhər kanı olmasını qeyri adiliklə vurğulayır. Bir daha qeyd edək ki, bu Vaqifə öz dövründə verilən ən yüksək qiymətdir.

“Oğuznamə” əsərində belə bir deyim vardır: “Ər ondur, toqyzı tondur” (Oğuznamə, 1987: s. 55). Məncə, bu deyimdə “don” ifadəsi igidliyin müxtəlif növləri, igidliyi şərtləndirən amillər baxımından işlədilmişdir. Heç də o demək deyildir ki, igid donunu dəyişməklə, 9 don geyməklə qələbə çala bilər. Əsla yox. Atalar igidliyi təkcə igid ərlə deyil, onu igidliyə, qələbəyə qovuşduran döyüş-sursat növlərini də 9 rəqəmi ilə qeyd etmişlər. Belə ki, igidə qılınc, qalxan, yay-ox, nizə, təbərzin, kəmənd, əmud, cida, zirehli don və ilahi güc lazımdır. Müasir dövrümüzdə isə dilimizdə belə bir atalar sözü işlənir: “Gözəllik ondur, doqquzu dondur”. Məncə, bu deyimdə də söhbət təkcə dondan, geyimdən deyil, Tanrı gözəlliyini əks etdirən gözəl boydan, xoydan, sevgidən, gözdən, candan, bədəndən, qamətdən, gərdəndən və təbii ki, gözəllikləri tamamlayan gözəl geyimdən də gedir. Bütün gözəlliklərin sərrafı olan Molla Pənah Vaqif beş bəndlik bir təcnisində gözəl sözünü 43 dəfə müxtəlif məna çalarlarında işlətmiş və 1-ci bəndin 4 misrasında, 2-ci bəndin isə 1-ci misrasında yuxarıda söylədiyimiz atalar sözünə uyğun olaraq gözəlliyin 10 olduğunu və 9-nun isə müəyyən formalarını, növlərini sərraf dəqiqliyi ilə belə qeyd etmişdir ki, 1). gözəl boy, 2). gözəl xoy, 3). gözəl yar, sevgili yar, 4). gözəl üz, 5). gözəl göz, 6). gözəl can, 7). gözəl bədən, 8). gözəl qamət, 9). gözəl don. Onuncu isə gözəlin geyindiyi al ilə qeyd

olunmaqla gözəlliyi tamamlayır. Molla Pənah Vaqifin bu təcnisini Vaqif sənətkarlığının göstəricisi olduğu üçün burada təqdim etməyi önəmli sayıram.

Gozəl boylu, gözəl xoylu, gözəl yar,
Nə gözəlsən, geyinibsən alı sən.
Gözəl gözün hərdən qıya baxanda,
Gözəl canı, gözəl candan alı sən.

Gözəl qamət, gözəl gərdən, gözəl üz,
Gözəl olmaz səntək, olsa gözəl yüz,
Gözəl canı munca yetər gözəl üz,
Gözəl deyil, etmə gözəl, alı sən.

Gözəl durub, gözəl gəzib, ğözəl bax,
Gözəl kəlbəb, sal boynuma gözəl bağ,
Gözəl seyrü gəşt eləyib, gözəl bağ,
Gözəl, dər budaqdan gözəl alı sən.

Gözəl saqi, gözəl tutub, gözəl kəs,
Gözəl doğra kabab bağrım, gözəl kəs,
Gözəl canan, gözəl adam, gözəl kəs,
Bir gözəl kimsənin gözəl alısən.

Gözəl, qapındadır, gözəl, hey dərin,
Gözəl, sev demişəm, gözəl hey, dərin,
Gözəl, Vaqif qulun, gözəl Heydərin,
Gözəl, yetiş dadə, gözəl Alı sən.
(Molla Pənah Vaqif, 2004: s. 141).

Molla Pənah Vaqif yaradıcılığında qoşma, qəzəl qəsidə, tərcibənd, mürəbbe, müstəzad və s. şeir janrlarına rast gəlirik. Vaqif şeirlərində Qazax şivəsi ilə Qarabağ dialektinin sinxronik canlı danışıq şirinliyinin damaqlardan getməyən poetik şirinlik dadı, onun xalq arasında sevilməsinə, yadda qalmasına və yaşarlılıq qazanmasına səbəb olmuşdur:

Hər gedən gəlmiş, mənim ol qəmküsarım gəlməmiş,
Ey gözüm, qan ağla kim, çeşmi-xumarım gəlməmiş.

Getmiş idi ixtiyarım, biləsincə yarımın,
Çünki yarım gəlməmiş, həm ixtiyarım gəlməmiş.

Mən bu dərd ilə əgər ölsəm, məzarə qoymayın,
Üstümə ol tuti dilli şux nigarım gəlməmiş.

Deməsin, Vaqif, əcəl gəlsə məndən can alır,
Kimdir ona can verən fərmani-yarım gəlməmiş?!
(Mir Möhsün Nəvvab, 1989: s. 26).

Misaldan da göründüyü kimi dilə dolaşan, ahəngdarlıqdan kənar, axıcı olmayan, musiqililik xaricində olan səs, söz və cümlə tapmaq mümkün deyildir. Sanki bütün misralar qəlibə uyğun biçilib, kürədə bişirilmişdir:

Mehribanlıq görməyib, bir məhliqadən küsmüşəm,
Gündə yüz al eyləyən qəlbi qarədən küsmüşəm.

Şəninə dedim şirin söz, bir şey ondan dadmadım,
Bu səbəbdən ağzı şəkkər dilrübadən küsmüşəm.

Bir qədər mey istədim, sındırdı qəlbim şişəsin,
Daş bağırlı saqiyi-sahibcəfadən küsmüşəm.

Çün uman yerdən küsərlər, bu məsəldir xəlq ara,
Küsdüyüm bica deyildir, aşinadən küsmüşəm.

Gördüm əvvəl kim, deyil böylə binayi-yarlıq,
Vaqifa, əsli budur: Mən bu binadən küsmüşəm.
(Mir Möhsün Nəvvab, 1989: s. 27).

Müasir dövrümüzdə Molla Pənah Vaqif alimlərimiz tərfindən geniş tədqiq olunmuş və layiqli qiymətini almışdır. Firidun Şuşinski bir xatırlatmasında Vaqifin müasir durumda kəsb etdiyi məna dəyərini belə səciyyələndirir: "Vaqif poetik dilimizin yaradıcısıdır. Təsadüfi deyildir ki, Firudun bəy Köçərli Vaqifi "ədəbiyyatımızın banisi, müəssisi" adlandıraraq qeyd edir ki, bütün Qafqazda Vaqif kimi dili şirin, sadə, xoşkəlam və müqtədir bir ədib zühur eləməyib. Vaqifin el arasında məşhur olmasının əsas səbəbi onun rəvan təbinin olması, qafiyələrinin, gözəl kəlamının aydın və axıcı olmasıdır. Şair nə yaradıbsa, bulaq kimi saf olan döğma ana dilimizdə, ana şivəsində yaratmışdır. Onun şeirlərində türk sözləri elə məharətlə nəzmə çəkilibdir ki, oxuyanları valeh edir. Məsələn, bu sadəlikdə, aydın ləhcədə heç bir türk şairi qafiyələr tərtib etməyib:

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır.
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadan, nə şanədəndir.

Bir sözlə, biz Vaqifi milli şair kimi tanımaqla onu bir daha Turan dünyasının böyük sənətkarı kimi tanıyırıq...".(Firidun Şuşinski, 1998: s. 216).

Vaqif poeziyasının gücü onun xəlqi olması ilə bərabər forma, məzmun cəhətdən milli, ümumbəşəri olması ilə də səciyələnir. Yəni millilik və ümumbəşərilik Vaqif poeziyasının atributudur. Millilik, xəlqilik, sadəlik, nikbinlik, olduğu kimi həyat hadisələrini, gözəlləri, ğzəlliyi tərənnüm etmək Vaqifi yaşadan, sevdirən əsas amildir. Akademik Nizami Cəfərovun təbirincə desək: "Qarabağ bütün təbii gözəllikləri ilə Vaqif poeziyasının fəlsəfi-estetik təfəkkür mədəniyyətinin vətəni idi". Bu yerdə Vaqifin "Pəri" qoşması yada düşür, qoşma söylənilənlərə bariz nümunədir:

Boyun sürahidir, bədənin büllur,
Gərdənin çəkilmiş minadan, Pəri!
Sən ha bir sonasan cüda düşübsən,
Bir bölük yaşılbaş sonadan, Pəri!

İxtilatın şirin, sözün məzəli,
Şəkər gülüşündən canlar təzəli,
Ellər yaraşığı, ölkə gözəli,
Nə gözəl doğulubsan anadan, Pəri!

Üz yanında tökülübdü tel nazik,
Sinə meydan, zülf pərişan, bel nazik,
Ağız nazik, dodaq nazik, dil nazik,
Ağ əllərin əlvan hənadan, Pəri!

Avçısı olmuşam, sən tək maralın,
Xəyalımdan çıxmaz, hərkiz xəyalın,
Ənliyi, kirşanı neylər camalın,
Sən elə gözəlsən binadan,Pəri!

Günəş təki hər çıxanda səhərdən,
Alırsan Vaqifin əqlini sərdən,
Duaçınam, salma məni nəzərdən,
Əskik olmayasan sənadan, Pəri!

XX əsrin I yarısında Vaqifə ən yüksək qiymət verən, hətta həyatla ölüm arasında mübarizə aparıb "Vaqif" dramını yazan, Vaqif ədəbi məktəbinin davamçısı, dahi şairimiz Səməd Vurğun olmuşdur. Vaqif haqqında yazmışdır: "Azərbaycanın öz azadlığı uğrunda yadelli işğalçılara qarşı apardığı mübarizə tarixinin qəhrəmanlıq səhifələri Vaqifin adı ilə bağlıdır." (Səməd Vurğun, 1972: s. 119).

Adilxan Bayramov isə "Səməd Vurğun: Milli və ümumbəşəri" kitabında yazmışdır: "Səməd Vurğun xüsusi olaraq qeyd etmişdir ki, Azərbaycan xalqının böyük şair oğlu xalqının azadlığı uğrunda öz canını qurban vermiş, Azərbaycan dili uğrunda, farsçılığa, ərəbçiliyə qarşı mübarizədə böyük işlər görmüşdür. Səməd Vurğunun fikrincə, Vaqif gözəllik şairidir. Lakin onun gözəlləri "hurilər", "pərilər" deyil, yer qızlarıdır, həm də Azərbaycan qızlarıdır. Başı kəlağayılı, toylarda kəklik kimi süzən qız-gəlinlər, real insanlardır". (Adilxan Bayramov, 2006: s. 44).

Misallardan göründüyü kimi Molla Pənah Vaqif "Azərbaycanın öz azadlığı uğrunda yadelli işğalçılara qarşı mübarizə tarixinin qəhrəmanlıq səhifələri"nin bünövəsini qoyanlardan biri olmuşdur. Bu gün Şuşa uğrunda canından keçən, igidlik göstərərək erməni vandallarını döyüş meydanında məğlub edib, qələbə çalan Azərbaycanın cəsur və yenilməz igidləri, Vaqif yolunun davamçıları Vaqif yurdunda - Şuşada zəfər bayrağını dalğalandırırlar. Bu tarixi qələbə Vaqif arzularının təntənəsidir.

Yaşadığımız zaman kəsiyində Molla Pənah Vaqifin əbədiyaşar dahiliyini, əvəzolunmaz sənətkarlığını yüksək dəyərləndirən Azərbaycan Respublikasının Prezidenti İlham Heydər oğlu Əliyev "Vaqifin poeziya günü"nün keçirilməsini qarşıya qoymuş və demiş: "Molla Pənah Vaqif öz ənənələri ilə seçilən ədəbi məktəb yaratmış ölməz sənətkardır. O, əhəmiyyətini əsrlərdən bəri qoruyub saxlayan bənzərsiz poeziya nümunələri meydana gətirməklə milli ədəbiyyatın yeni istiqamətdə inkişafına təkan vermişdir". **İlham Əliyev**

Demək, Molla Pənah Vaqif haqqında Vaqifin sağlığında da, sonrakı əsrlərdə də və bu gün də verilmiş yüksək qiymət öz dəyərini qoruyub saxlamış və gələcəkdə də qoruyub saxlayacaqdır. Çünki Vaqif xalqımızın dəyəritirməz şəxsiyyətlərindəndir. Onun yaradıcılığı

milli-xəlqi poeziyamızın intibah başlanğıcı olmaqla bərabər, real əksetmə istedadı baxımından da yeni ədəbi məktəbin bünöövrəsini qoymuşdur.

Molla Pənah Vaqif yaradıcılığı özündən sonrakı ədəbi yaradıcılıq yolu üçün bir mayak rolunu oynamışdır. Bu ədəbi məktəb milli-xəlqi poeziyamızın realizm məktəbi idi. Bu reallıq bu günkü zəfər qələbəmizin özüdür.

Molla Pənah Vaqif yaradıcılğına XXI əsrin aynasından baxdıqda şairlik istedadının müasirlik zirvəsinə yüksəldiyinin şahidi oluruq. Bu zirvəni fəth edən əsas amil Vaqifin realizmində, bəşəri duyğulara hakim olmasında, konkret və lakonikliyindədir. Bunun özülünü isə şairin az sözlə dərin mənalar əks etdirməsi təşkil edir. Bu da şairin yüksək istedadının bariz nümunəsidir.

Nəticə olaraq deyə bilərik ki, böyük ədəbi məktəb yaratmış Molla Pənah Vaqif uzaqgörən insan, müasir gənclik üçün nümunə simvolu, istedadlı şair-diplomat, bacarıqlı maarif və mədəniyyət qurucusu kimi şöhrət tapmış tarixi şəxsiyyətdir.

## Reference

1. Karabakhnameh, II book, Baku, 1991, 479 p.
2. Mir Mohsun Navvab « Tazkireyi-Navvab», Baku, 1989, 559 p.
3. Kamran Mammadov. Minutes from the life of writers, Baku, 1970. 150 p.
4. Mirzah Yusif(Iosif) Karabakhi. Majmuayi-Vagif and contemporaries-another, Bakı, 1999, 151 p.
5. Firidun bey Kocharly. Azerbaijan literature, 2 Vol., I Vol., Bakı, 1978, 595 p.
6. Firudun Shushinsky. Shushah, Baku, 1998, 427 p.
7. Samad Vurgun. Works. 6 Vol., 5th Vol. Bakı, 1972, 426 p.
8. Adilkhan Bayramov, Samad Vurgun: National and universal, Baku, 2006, 315 p.
9. Oguzrameh. Baku, 1987, 223 p.
10. Mollah Panah Vagif. Works. Baku, «Sharg-Qarb»(East-West) publish house, 2004, 264 p.

Göndərilib: 05.07.2021 Qəbul edilib: 17.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/20-25

**Mehriban Oktay qızı Məmmədova**
Gəncə Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru, baş müəllim
mehriban.mammadova.67@mail.ru

# PARSELYASİYA CÜMLƏ ÜZVLƏRİNİN EMOSİONAL VƏ OBRAZLAŞDIRICILIQ NORMASI KİMİ

***Açar sözlər:*** *parselyasiya, parselyat, informativlik, konstruksiya, norma, nitq mədəniyyəti, nitq aktı*

**Parseling as emotional and image making norms**
**Summary**

The emotional and figurative norms of sentence members have different features, which also have a special place among the syntactic norms. Means of expression such as members, repetitions, parallels, parse, inversion, rhetoric are considered to be the emotional and figurative norms of sentence members. Among these units, which create emotional and figurative, parcel is distinguished by a number of features. Parselation is the transmission of the main idea in laconic parts. Parcels, which are considered to be one of the most important issues of modern syntax, are found in literary, scientific and journalistic works as a linguistic-stylistic phenomenon. The term parcel, translated as parcel, comes from French literary criticism. By means of parallelization, the text is divided into short thought units, so that the writer can draw the reader's attention to an important issue. Parallels are distinguished by punctuation in writing and intonation and pause in speech.
***Key words:*** *parselation, parcel, informative, construction, norm, speech culture, speech act*

## Giriş

Nitq aktının fəaliyyəti əsasında nitq mədəniyyətinin struktur normaları yaranır, formalaşır, sistemləşir. Nitq mədəniyyətinin struktur – linqvistik normaları aşağıdakı kimi təsnif edilir:

1.Sabit (ənənəvi), ümumdil müştərək, bərabərhüquqlu normalar.

2.Leksik vahidlərdə norma.

3.Morfoloji vahidlərdə norma.

4.Sintaktik normalar.

Sintaktik normalar sırasında cümlə üzvlərinin emosional və obrazlaşdırıcılıq norması fərqli cəhətlərə malikdir. Cümlə üzvlərinin emosional və obrazlaşdırıcılıq sırası həmcins üzvlərlə, təkrarlarla, paralellərlə, parselyasiya, inversiya, ritorika ilə, elliptik ifadə vasitələri ilə də müşahidə olunur. Bu ifadə vasitələrinin sabit normaya düşməsi asanlaşma, intensivlik və ritmik ardıcılllıq üzrə baş verir. Emosional və obrazlaşdırıcılıq yaradan vahidlər sırasında parselyasiya daha şox diqqəti cəlb edir. Parselyasiya əsas fikrin lakonik hissələrlə ötürülməsi kimi başa düşülür. Əsas məsələ fikrin tək-tək dəqiq, çoxmənalı konstruksiyalarla ötürülməsidir. Diqqəti cəlb etmək məqsədi ilə əsas cümlədən sonra fikir qısa cümlələrdə emosionallıqla ifadə olunur. Cümlə üzvlərinin emosional və obrazlaşdırıcılıq norması nitq mədəniyyətinin struktur normalar sisteminə daxildir.

Dilçiliyin tətbiqi sahəsi hesab edilən nitq mədəniyyətinin aparıcı qüvvəsi və strukturu - normalar sistemi dilin bütün dövrləri üçün aktual olaraq qalır. Dilçilik üzrə aparılan tədqiqatların nəticəsi nitq mədəniyətinin formalaşmasına xidmət edir. Nitq mədəniyyəti

normalar sistemidir. Bu normalar dilin bütün səviyyə və şöbələrində fəaliyyət göstərir. Nitq mədəniyyəti dilin praktik reallığıdır, şüurudur. Nitq mədəniyyətihər bir dövlət dilinin zəruri problemlərindən hesab olunur. Belə ki, ölkədaxili informasiyaların təmin olunması ilə dövlət dilinin vəzifəsi bitmir. Beynəlxalq informasiya məkanına müstəqil bir obyekt kimi daxil olmaq imkanı da dövlət dilinə məxsusdur. Dil ictimai hadisə kimi xalqın milli mədəniyyətini, mənliyini, ənənlərini, məişət həyatını, ictimai şüurunu, yaradıcı təfəkkürünü əks etdirir. Informasiya mübadiləsinin düzgün qurulması, yayılması, ötürülməsi və anlaşıqlılığı nitq mədəniyyətinin normalarını sabit və mükəmməl olmasına dəlalət edir.

Nitq mədəniyyəti müasir Azərbaycan dilinin mühüm problemlərindən biri olduğu üçün onun inkişaf etdirilməsi müasir qloballaşma şəraitində milli mədəniyyətin, qorunması və bu sahəyə beynəlxalq aləmdə maraq yaradılması baxımından əhəmiyyətlidir. Nitq mədəniyyətində tədqiq edilən normalar sırasında nitqin emosionallığının təmin edilməsinə xidmət edən normalar xüsusi əhəmiyyət kəsb edir.

Fransız ədəbiyyatşünaslığından gələn parselyasiya termini (parselle) hissə kimi tərcümə olunur. Parselyasiya vasitəsi ilə mətn qısa fikri vahidlərə bölünür, bununla yazıçı oxucunun diqqətini mühüm məsələyə cəlb edə bilir. Bu zaman yazıçının dili canlı və sərbəst olur. Mətndə parselyasiyalar müxtəlif vasitələrlə - böyük hərflə və ya durğu işarələri ilə fərqləndirilir. Yuxarıda qeyd edildiyi kimi əsas cümlə olmadan parselyariv konstruksiyadan danışmaq mümkün deyil. Əsas olmadan qırıq-qırıq nitq parçaları heç bir emosiya ifadə edə bilməz, cümlə məntiqsiz görünər.

“Mən? Sizə? Telefon verdim? Mənasız söz!” cümləsində təkcə adi hərəkətin təsviri yox, eyni zamanda təəccüb hissi ifadə olunur. Burada ideya bir yox, bir neçə intonasiyalı vahidlərlə verilir.

Dilin ifadəetmə vasitələri nitqi aydın, zəngin edir, onun emosional təsirini artırır. Sənətkarların istifadə etdikləri çoxsaylı stilistik fiqurlar içərisində parselyasiyalar xüsusi yer tutur. Klassiklərdə olduğu kimi, müasir yazıçı və şairlərin əsərlərində tez-tez parselyasiyalara rast gəlinir. Parselyasiyalar yazıda durğu işarələri ilə, nitqdə isə intonasiya və fasilə ilə fərqləndirilir.

Parselyasiya müasir sintaksisin maraqlı hadisələrindən hesab olunur. Linqvistik – üslubi hadisə hesab olunan parselyasiyalara bədii, elmi və publisistik əsərlərdə rast gəlinir.

Dilçilik elminə “parselyasiya” terminoloji vahidini XX əsrin 60-cı illərində rus dilçisi Y.V. Vannikov gətirərək parselyasiya nəzəriyyəsinin əsasını qoymuşdur. Parselyasiya mətnin aktiv proseslərindən hesab olunur. İndiyə qədər yazılmış tədqiqat əsərlərində “təməli qoyulmuş aktiv sintaktik quruluşun və imkanların göstəricisi kimi təsvir olunub”. “Parselyasiya” termin-anlayışını təyin edərkən tədqiqatçılar belə bir fikir irəli sürürlər ki, “parselyativ quruluş müstəqil fraza, söyləm və cümlənin tam strukturu ilə birlikdə yaranır. Həmin quruluşdan kənarda parselyasiya mövcud deyil” (Валигина, 2001:147).

Nitqin bu cür qurulması qoşulan hissənin semantik zəifliyinə deyil, əksinə aktuallaşmasına səbəb olur. Nitq prosesində yaranan bu cür əlaqəli cümlələrdən birincisinə əsas (özül, baza) cümlə, sonrakına qoşulma konstruksiya deyilir. Qoşulma konstruksiyalar bir çox hallarda bir özül cümlənin bölünməsi, parçalanması əsasında əmələ gəlir. Dilçilikdə bu hadisəyə “parselyasiya”, qoşulan konstruksiyalara isə parselyat deyilir. ( Məşədiyev,1985:№ 2, səh. 103, 105).

Parselyasiya həm də asimmetrik – sintaktik hadisə kimi əvvəlcə şifahi nitqdə, sonra isə yazılı mətnlərdə gerçəkləşmişdir. Parselyasiya sadə və mürəkkəb cümlənin qırılaraq mətnləşməsidir. Ayrı-ayrı komponentlər sadə və mürəkkəb cümlələrdən qoparaq konteksdə yeni intonasiya ilə deyilir. Ayrılan parselyatlar bir mürəkkəb sintaktik bütöv təşkil edir.

İlk dəfə rus dilçiliyində tədqiq olunsa da parselyasiya hadisəsinə Azərbaycan dilinin həm şifahi nümunələrində, həm də çağdaş ümumtürk ədəbi- bədii mətn nümunələrində təsadüf edilir. “Kitabi-Dədə Qorqud”, “Koroğlu”, “Manas” kimi qəhrəmanlıq dastanlarının dilində parselyatik konstruksiyaların müxtəlif tiplərinə təsadüf edilir.

Parselyasiyanın əsas funksiyası obrazın monoloqsuz daxili aləmini göstərməkdir. “O qəfildən durdu. Stola yaxınlaşdı. Oturdu. Fikirləşdi. Tez birinci sətri yazdı.”

Parselyasiyanın təsviri funksiyasında məqsəd fikri müəyyən detallara yönəltməkdir. “Siz? Mənə? Nəsə borclusunuz? Ola bilməz! – deyərək çiynini çəkdi.”

Cümlə üzvlərinin bir-biri ilə əlaqəsinin dəyişməsi parselyasiyanın ekspressiv – qrammatik funksiyasıdır.

“Parselyasiya cümlə tərkibindəki sintaqmlardan birinin və ya bir neçəsini sona keçirib xüsusi fasilə vasitəsi ilə müstəqilləşdirməkdən ibarət ifadə tərzidir. Parselyasiyada fikir bir sintaktik vahidlə deyil, bir neçə az-çox müstəqilləşən nitq vahidində ifadə olunur.....” “ifadə edilən fikir bir sintaktik vahiddə deyil, bir neçə az-çox müstəqilləşən nitq vahidində əks olunur. Müasir bəddi üslubda parselyasiya bir ifadəlilik vasitəsi kimi geniş yayılmışdır. Bu ifadə üsulu mənalılığına və ekspressiv çalarlığına görə əhəmiyyətli bədii vasitə hesab olunur.(Adilov, Verdiyeva, Ağayeva: 1989: 214).

Parselyativ, bölünən hissə cümlədən kənar hər hansı bir üzvün informativ və emosional cəhətdən intensivləşdirilməsinə xidmət edir. Bu hadisəni qrammatik tərkibinə görə cümlədən kənaraçıxma kimi də adlandırmaq olar.

Parselyasiya sadə mürəkkəb cümlələrin qırılaraq mətnləşməsi deməkdir. Türk yazı dillərində mətnləşmənin əsas təşəkkül və həm nəsrlə, həm də şeirlə ifadə olunan təkamül yollarından biridir. Təkamül yollarından danışarkən Azərbaycan xalqının qədim mədəniyyət abidəsi olan “Kitabi-Dədə Qorqud”un dilini xatırlamaq yerinə düşür. Dastanların dilinin tədqiqinə həsr olunmuş əsərlərdə haqlı olaraq abidənin dili poetik dil adlandırılır. Poetiklik kitabın dilinin ecazkarlığı, əzəməti və vüsəti ilə məhdudlaşmır. Kitabın dili elə bir bənzərsiz üsluba malikdir ki, tarix boyu bu üslubda yazılmış ikinci bir nümunəyə rast gəlmək mümkün deyil. “Onun üslubu bütün dil səviyyələrinə məxsus elementləri poetikliyə gətirib çıxaran bədii paralellik nümunəsinə çevrilmişdir”. (Yusifov, 2019:15.). Belə qoşulma konstruksiyaların tarixi qədimdir.

“Kitabi - Dədə Qorqud” dastanlarının dilində obrazlaşdırıcılıq və emosionallıq yarada bilən parselyasiyalara rast gəlinir ki, bunlar da poetikliyi nəzərə çarpdıran ifadə vasitəsidir.

Sağına – soluna göz gəzdirdi, oğlancığını görmədi. Qara bağrı sarsıldı. Düm ürəyi oynadı. Başlar kəsildi. Top kibi. Cilasun qoç yigitlərə qalaba ölkə verdi: şalvar, cübbə, çuqa (“Kitabi-Dədə Qorqud”, 1962: 22-27).

Parselyatlar bazis cümlədəki buraxılmış olan genişləndirici üzvləri konkretləşdirir.

Müasir Azərbaycan dilində parselyasiya ən çox yayılan və danışıqda tez-tez istifadə edilən, ancaq az tədqiq olunan hadisədir. Nitq mədəniyyəti məsələlərinin dərindən öyrədilməsi məqsədi ilə parselyasiyanın geniş tədqiqi xüsusi əhəmiyyətə malik olan dil hadisəsidir. Parselyasiyada struktur ardıcıllığının pozulması nitq aktının intensivləşmə prinsipi əsasında yenidən normalaşma baş verir və bu normalaşma ümumdil xarakteri qazanır.

Sintaktik hadisə kimi parselyasiya mətnin informativliyinin təmin olunmasında mühüm rol oynayır. Kontekst, məna dolğunluğu, məntiqilik, ardıcıllıq, aydınlıq və anlaşıqlıq informativliyin ölçü meyarları sırasındadır. Müxtəlifsistemli dillərdə informativlik bu ölçü meyarları ilə səciyyələnir.

Parselyasiya mətnlə bağlı məsələdir. Mətn – nitq yaradıcılığı ardıcıllığını nəzərə alsaq bu hadisə insanın nitq fəaliyyətinin nəticəsi kimi özünü göstərir. Parselyasiya hadisəsini onun

qrammatik tərkibinə görə cümlədən kənara çıxma kimi də adlandırmaq olar. Parselyasiyalar bağlı olduqları bazis cümlələrin mübtədasını, tamamlığını, təyinini, zərfliyini və s. digər açıq olaraq ifadə olunmamış üzvlərini və ya oxşar anlamlı cümlələrini tamamlayır və semantik cəhətdən konkretləşdirir. Yazışılar qoşulma konstuksiyalardan – parsellərdən geniş istifadə edirlər.

Qaçan adam hasar dalında gizləndi, xeyli müddət yerindən tərpənə bilmədi-mübtədanın kənara çıxması.

İndi bildim ki, yolda bizi gözləyən kim imiş, qonşunun oğlu Əhməd-xəbərin kənara çıxması.

O dostlarını çağırdı, ancaq heç yerdən soraq gəlmədi, nə içəridən, nə bayırdan - tamamlığın kənara çıxması.

Nümunələrdə kənara çıxan tərəflərin özü cümlə tipli olsa da əvvəlki cümlənin mübtədasına aid hərəkəti və hal- vəziyyəti canlandırır.

Parselyatlar özündən əvvəlki bazis-cümlədən qopub ayrılır, onun ifadə edilməmiş, yaxud da “yarımçıq üzə çıxarılmış” mübtədasını, tamamlığını aydınlaşdırır və semantik baxımdan əvəz edir.

Parselyasiyalar həm də obrazlaşdırıcılıq vasitəsi kimi də istifadə olunur. Az sözlə, lakonik cümlələrlə obrazın daxili aləmini açа biləcək fikirlər ifadə olunur.

Hara aparıb çıxardır?

-Düşmənçiliyə! .... (Şıxlı. 1986: 59.)

Qurban, bəsdir! Kərəm kimiləri ac qoyan sənsən!

-Kim, mən? (Şıxlı, 1986: s.61)

-Bəs sən nə istəyirsən, oğul?

-Çox şey!... Deyin görüm.... (Şıxlı, 1986: 68)

Şahnaz köksünü ötürdü:

-Nə bayram, ay nənə? Nə?! Yağ-pendir? Başına söz qəhətdir(Şıxlı,1986: 77)

Ədəbiyyatşünaslıq terminləri lüğətində parselyasiya üslubi fiqur kimi göstərilir və belə bir izahat verilir ki, ... vahid sintaktik strukturun yəni cümlənin intonasiya və mənaca bir neçə müstəqil nitq vahidinə bölünməsi. Bu zaman cümlədə predikativlik pozulur. (Ədəbiyyatşünaslıq terminləri lüğəti, 2017:) .

Parselyasiya (fransız-parselle-hissə ) yer sahələrinin bölünməsi deməkdir. Linqvistikada isə bu, hər şeydən öncə, nitq fəaliyyətində özünü göstərən kommunikativ – informativ fakt kimi başa düşülür. Parselyat qoşulma konstruksiyalar bazis-cümlənin hər hansı bir ifadə edilməmiş üzvünü (mübtəda, tamamlıq və s.) konkretləşdirir, aydınlaşdırır, ümumiləşdirir. Parselyat-konstruksiya bazis cümlə ilə birlikdə dilin invariantı, nitqin isə variantı hesab olunur.

Qaçaq Murad paltar dərdindən qurtarandan sonra onu təzə bir dərd aldı: hara getsin? (Kərimzadə, 1987: 7.)

Çinarın çılpaq gövdəsi neçə rəngə çalırdı. Qırmızı, göy, yaşıl, sarı.( s.9)

Bu ağ gövdəli ağac Ağqoyunlulardır... Bəli, sülalədir. (s.9)

Necə də rahat, təmkinli hökmlüdür. Cansızdır, cəsədsizdir, amma üstündə oturanlara hikkə verir, hakimiyət verir. Asa da bilir, kəsə də bilir.(s.10)

Hökmdar, qurban, bu yaşdakı məhəbbətin nə demək olduğunu gözəl bilirəm. Qəlbin narahatlığı, ürəkdəki sevinc... (Kərimzadə, 1987: 35).

Canlı dilin ən mühüm mənalı ünsürü intonasiyadır. Adi praktik nitqdə intonasiya əsas kommunikativ funksiya, ifadənin məzmununun dinləyiciyə çatdırılmasına xidmət edir.

Bədii nəsr əsərlərində intonasiyanın komponentləri məqsəddən asılı olaraq müxtəlif şəkildə əlaqələnir, tənzimlənir, beləliklə də, əlavə estetik keyfiyyət və əhəmiyyət kəsb edir.

Nəsr dilində emosionallığı artırmaq, əsərin ekspressivliyini gücləndirmək, aktuallaşmanı nəzərə çarpdırmaq, fikri daha qabarıq ifadə etmək üçün yazıçılar bir sıra vasitələrdən istifadə edirlər.

Bu cür konstruksiyalar özəl cümlədəki fikri dolğunlaşdırmaq, genişləndirmək, əlavə məlumat vermək və ya fikri dəqiqləşdirmək məqsədi güdür. Parsel konstruksiyalardan istifadə edərkən bazis cümləyə qoşulan parselyatlar silsiləsinin izlənməsi nəticəsində bütöv cümlənin strukturu bir neçə hissəyə parçalanmış olur.

Cümlənin ümumi qrammatik strukturunu saxlamaqla parselyasiyalarda intonasiya və ritmin qalxıb enməsi poetik ovqat yaradır. Bu da nəsrin emosionallığını, ekspressivliyini təmin edir. F. Ağayeva "Azərbaycan dilinin intonasiyası" adlı kitabında parselyasiyanı ekspressiv sintaksisə məxsus ifadə tərzi kimi qiymətləndirir.

Parselyasiyanın aşağıdakı xüsusiyyətləri emosionallığın və obrazlaşdırıcılığın artmasına xidmət edir.

1.Parselyasiya vasitəsi ilə surətin psixoloji durumu, xəyalı təsvir olunur

-Satqın Sarı Şıxı bəy! Sən gədəlik elədin. Sən məni satdın. (s.91)

2.Surətin bir sıra hərəkətləri, gördü

yü işlər xüsusi nəzərə çarpdırılır.

-Bunu insan əli yaradıb?

- Bəli, Kəmaləddin Behzadın fırçası ilahi vergisidir (Kərimzadə, 1987: 71.)

3.Gərgin anlar daha qabarıq əks etdirilir.

-Zindana? Nəyə görə?

-Sonra bilərsən. Aparın. (Kərimzadə, 1987: 75.)

4.Parselyatların zənzirvari cərgəsi təhkiyəyə ahəngdarlıq, axıcılıq verir, fikrin daha geniş və əhatəli ifadəsinə, yeni detallarla zənginləşməsinə imkan yaradır.

Yol kənarında qoca bir çinar ağacı vardı. Kötüyünə örkən dolanmazdı (Kərimzadə, 1987: 49.)

Çadırın baş tərəfində Şah İsmayıl oturmuşdu. Bir tərəfində Hüseyn bəy Lələ, bir tərəfində də Dədə bəy. (Kərimzadə, 1987: 89.)

5.Dialoqda fikrin aydın, sərbəst çatdırılmasına kömək edir.

Arazqıraqlıyam. Xudafərin körpüsü tərəfdən. (Kərimzadə, 1987: 55)

Parselyasiyadan istifadə əsərlərin dinamikasını artırmaq, təsvirləri hərəkətsiz vəziyyətdən çıxarıb canlandırmaq nəhayət əsərdə danışıq kaloriti yaratmaq və assosiasiya yolu ilə həyat həqiqətlərini daha da reallaşdırmaq imkanı verir.

Emosionallıq və obrazlaşdırıcılıq vasitəsi kimi inversiyalar da diqqəti cəlb edir. Bəzən inversiyalarla parselyatlar eyniləşdirilir. Latınca yerdəyişmə mənası verən inversiya ifadəlilik əldə etmək üçün nitqdə sözlərin adının, ümumişlək sırasının pozulması, cümlə üzvlərinin yerlərinin dəyişdirilməsi kimi başa düşülür. Psixoloji və üslubi effekt yaratmaq üçün inversiyadan istifadə olunur.

Inversiyanın cümlə üzvü ilə bağlı olması onun qrammatik funksiyasıdır. Cümlədə yerini dəyişən üzv cümlədən təcrid olunmur, əksinə, qrammatik cəhətdən cümlə ilə bağlı olduğu kimi, informativlik cəhətdən onun mənasını bir daha qüvvətləndirməyə xidmət edir. Inversiyanın parselyasiyadan fərqi odur ki, parselyasiya əsas cümlədəki hər hansı üzvə məxsus informativliyi, emosiyanı və obrazlaşdırıcılığı canlandırır, inversiyada isə eyni cümlə üzvü öz yerini dəyişməklə cümlədə intensivlik yaradır. Parselyasiya kimi inversiyada da cümlə üzvlərinin hər birinə məxsus intensivləşmə müşahidə edilir. Cümlə üzvlərinin inversiyasına dair nümunələrdə bunu aydın müşahidə etmək olar.

## Nəticə

Cümlədə emosionallıq və obrazlaşdırıcılıq yaradan həmcins üzvlər, təkrarlar, paralellər, parselyasiya, inversiya kimi vasitələr, bir qayda olaraq cümləyə xüsusi qrammatik elementlərlə bağlanmır. Onların cümləyə bağlılığı cümlənin mənasının canlandırılmasına, emosional-psixoloji halların çatdırılmasına xidmət edir. Bu cür hallar qrammatik vasitələrlə icra olunmursa onların formalaşmasında dilin aqlütinativliyi elə bir ciddi rola malik olmamışdır. Ona görə də sadalanan vasitələr bir-biri ilə əlaqədardır. Deməli, bu cür ifadə formaları aqlütinatvlikdən əvvəlki dövrün məhsulu kimi formalaşmışdır. Aqlütinativlik prosesində qrammatik quruluşu mphkəmləndirmək üçün zəngin əlaqə vasitələri yarandıqdan sonra analitik prosesin izləri kimi mövcud olan elementlər, artıq qrammatik funksiyasını itirərək emosionallıq və obrazlaşdırıcılıqvəzifəsini yerinə yetirməyə başlamışdır. “Danışıq dilinin ümumi səciyyə daşıdığı dövrlərdən analitizm mərhələsinin məhsulu olan elementlər bu mühitdə cilalanaraq emosiyalı və obrazlaşdırıcı vahidlər kimi həm danışıqda, həm xalq dili mühitində formalaşmış nağıllarda, dastanlarda, atalar sözləri və zərbi məsəllərdə sabitləşərək yaşamaqda davam edir” (Yusifov, 2019, s.211). Mətnin informativliyinin təmin olunmasında sintaktik hadisə kimi parselyasiya mühüm rol oynayır. Reklam və informasiya xarakterli mətnlərdə parselyasiyalardan istifadəyə ehtiyac yoxdur. Təsadüfi parselyasiya, parselyasiyalardan həddən artıq istifadə nitqə xələl gətirir. Nitqə danışıq xarakteri verən parselyasiya auditoriyanın diqqətini təqdim edilən informasiyaya yönəldir. Rus dili üçün o qədər də xarakterik olmasa da müasir Azərbaycan dilində parselyasiya ən çox yayılmış və danışıqda tez-tez istifadə edilir. Ancaq Azərbaycan diliçiliyində az tədqiq olunan hadisədir. Nitq mədəniyyəti məsələlərinin dərindən öyrədilməsi məqsədi ilə parselyasiyanın geniş tədqiqi xüsusi əhəmiyyətə malik olan dil hadisəsidir.

## References


1. Agayeva F.M. Intonation of the Azerbaijani language. Baku: API, 1973
2. Adilov M.I., Verdiyeva Z.N., Agayeva F.M., Descriptive linguistic terms. Baku, Maarif, 1989, p.214
3. Adilov M.I., Verdiyeva Z.N., Agayeva F.M., Descriptive linguistic terms. “Science and Education” Baku-2020 p.214.
4. Dictionary of literary terms Baku, “Golden book”, 2017.
5. "Kitabi-Dada Gorgud". Azerbaijan State Publishing House Baku-1962.p.22.
6. Kazimov G.S. History of the Azerbaijani language (from the most ancient times to the XIII century): Baku: Education, 2003
7. Kazimov I. Parsing phenomenon in the Azerbaijani language - Teaching the Azerbaijani language and literature, 1989, № 2. Pages, 17-19
8. Karimzade F. The Battle of Chaldiran. Baku-1987. Page 7.
9. Mashadiyev A. Some features of speech in the feuilleton language (parcellation), -News of the Academy of Sciences of the Azerbaijan SSR: Literature. Language and Art series.1985, №2, p.103, 105
10. M. Yusifov Speech culture “Science and education” 2019, page, 15.
11. Shikhli I. S.ə.I c. P. 59. B 1986.
12. Valigina N.S. Active processes in modern Russian. M.: Logos, 2001 p.147.


Göndərilib: 12.07.2021 Qəbul edilib: 23.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/26-31

**Leyla Qadir qızı Məcidova**
Lənkəran Dövlət Universiteti
tarix üzrə fəlsəfə doktoru
kameliya-76@mail.ru

# AZƏRBAYCANIN QARABAĞ ZƏFƏR TARİXİNDƏN

***Açar sözlər:*** *zəfər tarixi, müharibə, düşmən, saxta xəbərlər, ərazi iddiaları, düşmənçilik*

## From the history of Azerbaijan' Karabakh victory

**Summary**

Nagorno-Karabakh, one of the ancient cultural centre of Azerbaijan, is generally a part of Karabakh area. Nagorno-Karabakh Autonomous region was founded in 4,4 thousand $km^2$ area of the mountainous part of Karabakh during the Soviet power in 1923. So, the basis of separatism was founded in this area. The main problem was that a group of armenians, who were moved here in the XVIII century, claimed that they possess these areas. Armenian-Azerbaijan conflict started with armenians' claims for Azerbaijan lands and provacations in the ethnic backgrounds in 1988. Armenians of Soviet Union representations, Armenian leader of SSRI power and the foreign Armenian diaspora began active work to unite Nagorno Autonomous region with Armenian, using the weakening condition of central power of Armenian SSRI at the beginning of 1980 years.

***Key words:*** *victory history, war, enemies, fake news, territorial claims, hostility*

Azərbaycanın qədim yaşayış mədəniyyət mərkəzlərindən olan Dağlıq Qarabağ ümumilikdə Qarabağ ərazisinin bir hissəsidir. Sovet hakimiyyəti dövründə 1923-cü ildə Qarabağın dağlıq hissəsində 4,4 min kv.km ərazidə Dağlıq Qarabağ Muxtar Vilayəti yaradılmışdır. Bununla da, bu ərazidə separatçılıq meyllərinin əsası qoyulmuşdur. Əslində isə problemin kökündə Qarabağa XVIII əsrdən başlayaraq köçürülən ermənilərin Azərbaycan torpaqlarına yiyələnmək iddiası dayanır. Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsi 1988-ci ildə ermənilərin Azərbaycanın tarixi torpaqlarına açıq formada ərazi iddiaları və etnik zəmində təxribatları ilə başladı. Sovet İttifaqı rəhbərliyində təmsil olunan ermənilər, Ermənistan SSR-in rəhbərliyi və xaricdəki erməni diasporu 1980-ci illərin əvvəllərindən SSRİ-nin mərkəzi hakimiyyətinin zəifləməsindən istifadə edərək Dağlıq Qarabağ Muxtar Vilayətinin Ermənistana birləşdirilməsi üçün fəaliyyətə keçdi.1987-89-cu illərdə Ermənistanda yaşayan 250 mindən çox azərbaycanlı öz tarixi torpaqlarından zorla qovuldu, onlardan 216 nəfər vəhşicəsinə qətlə yetirildi, 1154 nəfər isə yaralandı.

20 fevral 1988-ci ildə DQMV-nin Xalq Deputatları Sovetinin iclasında vilayətin erməni icmasının nümayəndələri DQMV-nin Azərbaycan SSR-dən Ermənistan SSR-ə keçirilməsi haqqında Azərbaycan SSR və Ermənistan SSR Ali Sovetlərinə müraciət etmək haqqında qərar qəbul etdi.

22 fevral 1988-ci ildə Əsgəran qəsəbəsi yaxınlığında ermənilər DQMV-nin Xalq Deputatları Sovetinin qərarına qarşı etiraz edən dinc azərbaycanlı nümayişçilərə atəş açdılar.Nəticədə həlak olan iki azərbaycanlı gənc münaqişənin ilk qurbanları oldu.

Azərbaycan döyüşlərdə hərb tarixinə yenilik kimi düşən strategiyanın tətbiqi ilə ən müasir silahlardan istifadəyə xüsusi önəm verdi. Nəticədə həm sürətlə irəlilədi, işğal altındakı ərazilərimizi yağılardan təmizlədi, həm də düşmənin bütün hərbi texnikasını darmadağın etdi, canlı qüvvəsinə ciddi zərbə vurdu. Bununla da beynəlxalq təşkilatların 30

il ərzində əldə edə bilmədiklərini Azərbaycan Ordusu Müzəffər Ali Baş Komandanın rəhbərliyi ilə qısa müddətdə gerçəkləşdirdi.

Sentyabrın 27-dən başlayan, 44 gün davam edən və Dağlıq Qarabağ da daxil olmaqla işğal altındakı ərazilərimizin qaytarılması ilə nəticələnən Vətən Müharibəsi tariximizin ən parlaq səhifəsinə, Azərbaycan xalqının iftixar və qürur mənbəyinə çevrildi. Azərbaycan xalqı öz liderinin - müzəffər Ali Baş Komandan İlham Əliyevin ətrafında sıx birləşərək bütün dünyaya öz gücünü, mətinliyini, mübarizliyini nümayiş etdirdi.Bu real faktordur ki, bütün müharibələrdə əsas sözü xalq və onun ordusu dediyi kimi uğurlu zəfərlərdə sərkərdənin də çox böyük rolu olur.Bu gün Azərbaycan xalqı hansı səviyyədə uğurlu sərkərdəyə - Ali Baş Komandana sahib olduğunu aşkar gördü. Prezident İlham Əliyev yalnız hərb meydanında müzəffər sərkərdə deyil, diplomatik cəbhədə böyük strateq nümunəsi ortaya qoydu, informasiya müharibəsində Azərbaycanın haqq səsi oldu, cəsarətlə bütün təzyiqlərə sinə gərdi, öz xalqı ilə vəhdətdə olan lider kimi mübarizlik rəmzinə çevrildi.

Ordumuz əks-həmlə əməliyyatları zamanı müasir texnoloji silahlarla düşmənin komanda-idarəetmə məntəqələrini, raket və artilleriya vasitələrini, döyüş texnikasını və təminatını sıradan çıxaraq onu faktiki olaraq iflic vəziyyətinə gətirdi.Müasir texnoloji silahlar Silahlı Qüvvələrimizin güc alətlərindən yalnız biri idi.Müharibənin taleyini müəyyənləşdirən başda Ali Baş Komandanımız, döyüş meydanında əsl qəhrəmanlıq göstərən Azərbaycan əsgəri və onun cəsur komandirlərioldu.Məhz onların səyi nəticəsində iflic vəziyyətə düşən Ermənistan ordusu arsenalında olan köhnə və istismar müddəti bitmiş silah sistemlərini də döyüşə cəlb etdi və nəticəsi rüsvayçı şəkildə uduzmaq oldu.Bununla da Silahlı Qüvvələrimiz “Ermənistan ordusunun nəğlubedilməzliyi” mifini darmadağın etdi. Beləliklə, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə sentyabrın 27-dən başlanan Vətən müharibəsi şanlı qələbə ilə sona çatdı, 44 gün davam edən hərbi əməliyyatlar çərçivəsində Azərbaycan Ordusu işğalçı Ermənistanın 30 il ərzində qurduğu silahlı qüvvələrini darmadağın edərək, böyük zəfərə imza atdı.

Ordumuzun sentyabrın 27-də Qarabağda başladığı uğurlu əks-həmlə əməliyyatları nəticəsində noyabrın 9-dək 5 şəhər, 4 qəsəbə və 286 kənd işğaldan azad edildi. Cəbrayıl şəhəri və rayonun 90 kəndi, Füzuli şəhəri və rayonun 53 kəndi, Zəngilan şəhəri, rayonun Mincivan, Ağbənd, Bartaz qəsəbələri və 52 kəndi, Xocavənd rayonunun Hadrut qəsəbəsi və 35 kəndi, Tərtər rayonunun 3 kəndi, Qubadlı şəhəri və rayonun 41 kəndi, Xocalı rayonunun 9 kəndi, Şuşa şəhəri, Lac□ın rayonunun 3 kəndi, həmçinin Ağdərə və Murovdağ istiqamətlərində bir neçə strateji yüksəklik, Zəngilanda isə Bartaz, Sıg□ırt, S□u□ku□rataz yüksəkləri və daha 5 adsız yüksəklik yağılardan təmizləndi.

Azərbaycan Böyük Qələbənin ilk addım səslərini noyabrın 8-də Qarabağın ürəyi sayılan, incisi hesab olunan Şuşa şəhərinin işğaldan azad edildiyi ilk saatlarda eşitdi. Bəli, bu qədim yurd yerimizin xilası ilə tam qələbəmizə yol açıldı. Düşmənin ağ bayraq qaldırmaq və kapitulyasiya etməkdən başqa yolu qalmadı. Döyüşlərdə bütün dünya Azərbaycan xalqının əzmini, Azərbaycan Ordusunun döyüş qabiliyyətini aydın gördü. Vətənpərvər xalqımızın öz Prezidentini necə dəstəklədiyi, onun ətrafında sıx birləşdiyi bir daha təsdiqləndi. “Ali Baş Komandanın bircə əmrinə müntəzirik”, –deyən Azərbaycan əsgər və zabitləri öz sözlərinin sahibi olduqlarını döyüşdə sübuta yetirdilər.

Prezident İlham Əliyev xalqa müraciətlərinin birində deyib: “Düşmənin əlində Azərbaycan Silahlı Qüvvələrinə məxsus olan bir dənə də hərbi texnika yoxdur... Döyüşlərin obyektiv müşahidə mənzərəsi var və istənilən hərbi mütəxəssis görə bilər ki, bu gün Azərbaycan Ordusu döyüş meydanında qələbə əldə edibdir.Azərbaycan Ordusu öz

üstünlüyünü göstərir, Azərbaycan əsgəri və zabiti yüksək mənəvi-psixoloji keyfiyyətlər göstərir, mənəvi ruh göstərir.Çünki biz öz torpağımızda vuruşuruq, öz torpaqlarımızı azad edirik.Ermənistanın əsgərləri işğalçılardır.Döyüş gedən torpaq onların torpağı deyil”.

Son bir neçə ilin statistikasına əsasən, ölkəmiz müasir silahlanmaya görə, Avropada 2-ci, dünyada 3-cü yerdə qərar tutub.Şübhəsiz ki, bütün bu uğurlar dövlətimizin başçısının həyata keçirdiyi məqsədyönlü ordu quruculuğu siyasəti sayəsində mümkün olub.

Əgər belə olmasaydı, hazırda Azərbaycan Ordusu torpaqlarımızı işğaldan azad etmək üçün BMT Təhlükəsizlik Şurasının kağız üzərində qalan 4 qətnaməsini təkbaşına reallaşdıra, hərb meydanında düşmənə qalib gələ, cəbhə xəttinin bütün istiqamətlərində əməliyyat şəraitinə tam nəzarət edə bilməzdi.

Azərbaycan Ordusunun yüksək peşəkarlığı, döyüş əzmi haqqında qardaş Türkiyənin xarici işlər naziri Mövlud Çavuşoğlu dövlətimizin başçısını qələbə münasibətilə təbrik edərkən, deyib: “Sizin qələbəniz, bizim qələbəmizdir, bu böyük zəfər münasibətilə təbrik edirik. Ali Baş Komandan olaraq, Sizin rəhbərliyinizlə qəhrəman Azərbaycan Ordusu nə edə bildiyini dosta, düşmənə nümayiş etdirdi, eyni zamanda, türkün gücünü də göstərdi. Bu prosesdə Sizin rəhbərliyinizlə qardaş Azərbaycan həm döyüş meydanında, həm də masada mövcudluğunu da göstərdi. Döyüş meydanında qələbələrinizə baxmayaraq, sülh yolu ilə, atəşkəs yolu ilə də bu münaqişənin həlli üçün böyük bir liderlik göstərdiniz.

Hərbi ekspert, “Nasionalnaya oborona” jurnalının baş redaktoru İqor Korotçenkonun “Pravda. ru” nəşrinə ordumuzun güc-qüdrəti ilə bağlı açıqlaması da diqqət çəkir.İ.Korotçenko birinci Qarabağ müharibəsindən danışaraq xatırladıb ki, Heydər Əliyevin hakimiyyətə qayıdışından sonra Azərbaycanda ordu quruculuğu diqqət mərkəzində saxlanıldı, bununla bağlı mühüm tədbirlər həyata keçirildi.Prezident İlham Əliyev 17 illik hakimiyyəti dövründə isə iri infrastruktur neft-qaz layihələrini həyata keçirdi və bundan əldə edilən böyük həcmli valyuta gəlirləri hesabına bütün Azərbaycan, eləcə də ordu sürətlə inkişaf etdi və regionun ən güclü silahlı qüvvəsinə çevrildi.

44 günlük Vətən müharibəsində rəşadətli Azərbaycan Ordusu, sözün əsl mənasında, düşmənin sinəsinə çalın-çarpaz dağ çəkib, düşməni tamamilə diz çökdürüb.Vətən oğulları öz canları, qanları bahasına torpaqlarımızı düşmən əsarətindənazad ediblər.Qurtuluş savaşında qəhrəmancasına şəhid olanlar, qazi adı qazananlar da oldu.

Müdafiə Nazirliyinin yaydığı məlumata görə, 44 günlük Vətən müharibəsində Silahlı Qüvvələrimizin 2783 nəfər hərbi qulluqçusu qəhrəmanlıqla həlak olub.Azərbaycan əsgəri əsl qəhrəmanlıq, mərdlik, şücaət, rəşadət nümunəsi göstərdi. Düşmənin 30 il ərzində qurduğu, milyonlarla vəsait sərf etdiyi nəhəng istehkamlar qısa müddətdə darmadağın edildi, müzəffər ordumuzun tətbiq etdiyi savaş strategiyası müasir hərb tarixinə yeni örnək oldu. Belə vəiyyətdə Ermənistanın qarşısında yalnız iki yoldan birini seçmək qalırdı.Ya Ermənistan ordusunun son tör-töküntüləri də döyüş meydanında son nəfərinə qədər məhv ediləcəkdi, ya da “ağ bayraq” qaldırıb, biabırçı hərbi məğlubiyyətini etiraf edəcəkdi.Paşinyan hakimiyyəti reallığı nəhayət ki, qəbul etdi və noyabrın 10-da Ermənistan “ağ bayraq” qaldırdı, kapitulyasiya bəyannaməsini imzaladı.

Maraqlı bir məqamı da qeyd etməyi zəruri bilirik. Ermənistanın müdafiə naziri David Tonoyan ölkəsinin imzaladığı bəyanatı xəyanət kimi qiymətləndirənlərə cavab verərək deyib: “Biz çox böyük bir qüvvəyə – super silahlı Azərbaycan Ordusuna qarşı vuruşduq. Məndən “bəs siz niyə silahlanmadınız?”, – deyə soruşa bilərsiniz. Biz də silahlı idik, ancaq kəmiyyət və resurslar baxımından imkanlar qeyri-mütənasib idi”.

Bəli, necə deyərlər, əlavə şərhə ehtiyac yoxdur.Düşmən ölkənin müdafiə nazirinin dediyi kimi, Azərbaycan Ordusunun kəmiyyət və resurslar baxımından güclü, əsgər və

zabitlərimizin isə yüksək peşəkarlığı, mübarizə əzmi işğalçının geri çəkilməsinə, döyüşdə təslim olmasına gətirib çıxardı.

Dağlıq Qarabağdakı ən böyük ikinci şəhər olan Şuşanın azad edilməsindən sonra Prezident İlham Əliyev, Vladimir Putin və Nikol Paşinyan arasında 10 noyabr 2020-ci il, saat 00:00-dan (UTC+3) etibarən bütün döyüş əməliyyatlarını dayandıran atəşkəs bəyanatı imzalandı. Arayik Harutyunyan da döyüş əməliyyatlarının dayandığını təsdiqlədi. Müqaviləyə əsasən, Azərbaycan müharibə zamanı işğaldan azad etdiyi ərazilərə nəzarəti əlində saxladı. Ermənistan isə işğal altında olan digər ətraf əraziləri Azərbaycana qaytardı.Azərbaycan, həmçinin Türkiyə və İranla həmsərhəd olan Naxçıvana dəhliz əldə etdi. Təxminən 2000 rus əsgəri Ermənistan və Dağlıq Qarabağ arasındakı Laçın dəhlizi boyunca ən azı 5 il müddətinə sülhməramlı qüvvələr olaraq yerləşdirildi.

İkinci Qarabağ müharibəsindəki şanlı Qələbə və Azərbaycanı Heydər Əliyevin görmək istədiyi dövlətə çevirməsi ilə cənab İlham Əliyev müqəddəs ata vəsiyyətini yerinə yetirdiyini bir daha təsdiqlədi.Ümummilli Liderin xalqımızın səadəti üçün arzuladığı gün Prezident İlham Əliyevin müdrik düşüncəsi ilə başa çatdı.Bugünkü Azərbaycan gəncliyi Vətən təəssübkeşliyini, xalqa sədaqət nümunəsini məhz cənab İlham Əliyevin həyat və fəaliyyətindən götürür. Çünki Azərbaycan gənclərinin günümüzün müasir, inkişaf etmiş, yüksək intellektli aparıcı qüvvə kimi formalaşmasında, birmənalı olaraq, Prezidentin apardığı gənclər siyasətinin mühüm rolu var. Müzəffər Ali Baş Komandanın "dəmir yumruq" əməliyyatı ilə 30 illik həsrətimizə son qoyub. Böyük qələbəni al qanı ilə yazan şəhidlərimizin intiqamının alınması ilə əldə edilən zəfəri, qalibiyyəti Azərbaycan xalqına bəxş etməklə Ali Baş Komandanımız İlham Əliyev həm də həyatını Azərbaycana həsr edən, "Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur" - deyən Ulu Öndərin arzusunu reallaşdırdı: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Qarabağ Azərbaycandır! 44 günlük qəhrəmanlıq savaşımız tarix boyu şanlı qürur mənbəyimiz olaraq qalacaq!

Ordumuzun ermənilərin hücumlarına cavab olaraq başladığı Vətən müharibəsi xalqımızın 30 illik həsrətinə 44 gündə son qoydu. Vətənpərvər oğullarımızın erməni təcavüzünü qəhrəmancasına dəf etməsi və əks-hücuma keçərək düşmənə sarsıdıcı zərbələr endirməsi xalqımızın qələbə əzminin nümayişi oldu. Bu günlər ərzində ordumuzun işğalçı erməni ordusuna qarşı apardığı müharibə milli şüurun, xalq və ordu birliyinin təcəssümünə çevrildi. Hər kəs Vətən fədaisi oldu o gün. İllərlə yaşadığımız ağrı-acılar bir andaca sevincə çevrildi. Ordumuzun bu qalibiyyəti bütün dünyaya nümayiş etdirdi ki, Azərbaycan xalqı qarşısına qoyduğu hər bir vəzifəni yerinə yetirə bilmək qüdrətindədir. Vətən müharibəsi bir daha sübut etdi ki, Azərbaycan Ordusunun hər bir fərdi özünü Vətən uğrunda fəda etməyə və düşmənə sarsıdıcı zərbə vurmağa qadirdir. Gedən döyüşlər bizim hansı iradəyə, hansı hisslərə sahib olduğumuzu göstərdi. Vətən müharibəsinin qəhrəmanlarından biri mayor Elsevər Hümbətov da öz ordusu, öz xalqı, öz milli mənliyi uğrunda qəhrəmancasına vuruşdu. Bu qəhrəmanlığı yüksək qiymətləndirən Ali Baş Komandan zabiti bir çox hərbi qulluqçularımız kimi 3-cü dərəcəli "Vətənə xidmətə görə" ordeni ilə təltif etdi. "Adi günlərdən biri kimi yaşayacağımız 2020-ci ilin 27 sentyabrı indi tarixdir - Zəfər tariximizin başlanğıcıdır. Həmin tarixdən xalqımıza məxsus olan milli qürur, əyilməzlik kimi keyfiyyətlər tüğyan etdi", -deyə zabit söhbətə başladı. -Vaxt gələcək 30 ildən bəri inşa edilmiş istehkamları yarıb keçən Azərbaycan Ordusunun əks-hücum əməliyyatları hərb

tarixi üzrə mütəxəssislər tərəfindən öyrəniləcək. Şuşanı işğaldan azad edən oğullarımızın şücaəti isə peşəkar hərbçilərin araşdırma mövzusu olacaq. Öz cəsarəti, igidliyi ilə Vətən torpağını azad edən və qətiyyəti ilə düşməni dizə gətirən Azərbaycan Ordusunun fəaliyyətini bütün xalqımız yüksək qiymətləndirir. Ordumuzun zəfər yürüşləri xalqımıza qol-qanad verdi. Erməni xainləri ordumuzun bu rəşadətli hünəri qarşısında diz çökdü. Yalan və hiylə ilə qurulan qondarma rejim özünün çürüklüyünü və iflasa uğradığını etiraf etdi. Dünyanı öz çirkin, bəd əməlləri ilə əsas həqiqətlərdən yayındırmaq istəyən xain düşmən ilahi həqiqəti aldada bilmədi. Otuz il bundan əvvəl ayaqyalın evindən, doğma yurd-yuvasından didərgin saldıqları insanların taleyini bu gün özləri yaşadılar. Zabit onu da qeyd etdi ki, sentyabrın 27-də ermənilər mövqelərimizi ağır artilleriyadan atəşə tutdular. "Verilən əmr əsasında düşmənin arxasında kəşfiyyat əməliyyatları aparmalı və həmin mövqeləri azad etməli idik. Düşmən o qədər də hündür olmayan yüksəklikdə mövqe tutmuşdu. Yüksəkliyi azad etdikdən sonra digər ərazilərə hücum etmək imkanlarımız daha da asanlaşacaqdı. Ona görə də bu mövqe qoşunlarımız üçün strateji əhəmiyyət kəsb edirdi. Nəhayət, ağır döyüş başladı... Biz üzərimizdəki güllələr, qumbaralar və silahlarla yüksəkliyə qalxır, bu da işimizi çətinləşdirirdi. Biz erməni postuna yaxınlaşdıqca onlar atəşi daha da sürətləndirir, erməni artilleriyasının atdığı mərmilər sağ-solumuzda partlayırdı. Bəzən mərminin düşəcəyini hiss etsək də, macal tapıb yerə uzana bilmirdik. Çünki həmin vaxt atılan hər addımın hədəfə çatmaq üçün əvəzsiz dəyəri vardı. Artıq şəhidlərimiz və yaralılarımız var idi... Allahdan şəhidlərimizə rəhmət və qazilərimizə şəfa diləyirəm. Döyüşün gedişində mən ayağımdan və sinəmdən qəlpə yaraları aldım. Yaralandıqdan sonra mənə elə gəlirdi ki, nəfəsim çatmır... Öz-özümə əmr verirdim ki, dayanmaq olmaz, yalnız irəli! Əmrimə əməl edə bilmədim. Gözümü açanda özümü hospitalda gördüm". "Ən əsası odur ki, bu müharibədə bütün xalq öz rəhbəri ətrafında bir yumruq kimi sıx birləşdi. Qələbəyə doğru inamla irəliləyən qorxmaz, cəsur əsgərlərimiz düşmənin işğal olunmuş torpaqlarımızdakı hərbi hissələrini, istehkamlarını, ön xətt mövqelərini, döyüş texnikalarını və infrastrukturunu, canlı qüvvəsini, cəbhənin dərinliyindəki atəş nöqtələrini, bazalarını darmadağın etdi, kəndlərimizi, strateji yüksəklikləri sürətlə tutdu", - deyə zabit sözünə davam etdi. Azərbaycan torpaqları qarış-qarış, kənd-kənd işğaldan azad edildi. Uzun illərdən sonra doğma torpaqlarımızda yenidən üçrəngli şanlı bayrağımız ucaldıldı. Vətən müharibəsi Ali Baş Komandanın, Azərbaycan Ordusunun, xalqımızın zəfəri ilə başa çatdı. Bu qələbəni Ali Baş Komandanın qətiyyəti, siyasi iradəsi, ordumuzun şücaəti hesabına qazandıq... Ona görə 44 günlük qəhrəmanlıq savaşımız tarix boyu şanlı qürur mənbəyimiz olaraq qalacaq.

44 günlük zəfərimiz barədə biz sosial şəbəkələrdə, həm də onun elmi tərəfinin tədqiqatları barədə də oxuyuruq. Bu zəfərin təfərrüatları hətta xarici ölkə institutları tərəfindən öyrənilməkdədir. Çünki bu zəfərin əldə edilməsində dünya hərb elminin istifadə etmədiyi üsullardan istifadə olundu. Burada Azərbaycan ordusunun göstərdiyi hünər həmin hərbi institutların diqqətini cəlb etdi və onu öyrənməyə qərar verdilər. Bizdə də bu istiqamətdə işlər gedir. Amma hesab edirəm ki, bu zəfər ayrı-ayrı istiqamətlərdə ayrıca mövzu kimi işlənməlidir. Məsəl üçün, Azərbaycan ordusunun malik olduğu hərbi texnika, yaxud, Azərbaycan əsgərinin bu savaş zamanı, xüsusilə, Şuşa şəhərinin alınması ilə bağlı həyata keçirdiyi əlbəyaxa döyüş... Bu döyüşdə Azərbaycan ordusu özündən altı-yeddi dəfə artıq və dişinə qədər silahlanmış düşməni əlbəyaxa döyüş taktikası ilə məğlub etdi. Bu döyüş əlbəttə, ayrıca öyrənilməlidir. 44 günlük savaş zamanı xalq-dövlət birliyinin yaranma səbəbləri dərindən tədqiq edilib yazılmalı və millətə təqdim olunmalıdır. Bu savaş müddətində arxa cəbhənin fəaliyyəti də tarixi baxımdan işlənməlidir. Bunları bir araya

gətirib bir kitab kimi nəşr edib millətə təqdim etməliyik. Millətin özünədərkində bu cür kitablar əvəzsiz rol oynaya bilər.

44 günlük müharibə haqqında orta məktəblərimizdə tədris olunan dərsliklərdə məlumat verilməlidir və veriləcəkdir. 2021-ci ildə istifadə ediləcək bütün dərsliklərdə bir neçə istiqamətdə dəyişiklik ediləcək. Birinci dərsliklərin xarici görünüşü (dizaynı) ilə bağlı olacaq. Belə ki, xüsusən orta-ümumi təhsil məktəblərində istifadə olunacaq 5,9,11-ci sinif Azərbaycan tarixi kitablarının üz qabığında 44 günlük zəfər ilə bitən Azərbaycanın Vətən müharibəsi, qəhrəmanlar və döyüş səhnələri haqqında illüstrasiylar öz əksini tapacaq. Niyə məhz 5,9,11-ci sinifin tarix kitabları? Ona görə ki, həmin dərsliklərin içərisində qeyd edilən faktlar müasir dövrü də əks etdirir. Yəni dövr baxımından bu həmin dövrə təsadüf edir. Çünki orta-ümumi təhsil məktəblərində istifadə olunan dərsliklərin üz qabığının tələbləri bundan ibarətdir ki, üz qabığı dərsliyin içərisində nədən bəhs edilməsi ilə bağlı ən azından ilkin anons, informasiya məlumatları verməlidir. İkinci dəyişiklik məzmunla bağlı ediləcəkdir. Məzmun və forma baxımından ediləcək dəyişiklik ondan ibarətdir ki, bizim dərsliklərimizin üz qabığında 28 ildir işğal edilmiş tarixi torpaqlarımız haqqında məlumat verilirdisə, artıq bu məlumatlarla yanaşı həmin torpaqların işğaldan azad edilmə tarixləri də veriləcək.

## References


1. History of Azerbaijan, 4th volume in 7 volumes. Baku-2007
2. Historical victory, Victory Day - NOVEMBER 8 Zarifa Guliyeva, Member of the Board of the YAP Women's Council, Chairwoman of the Modern Family and Development Public Union
3. The Azerbaijani Army won a historic victory in the 44-day war
4. V.Bayramov "People's newspaper" November 11, 2020
5. The 44-day war cost Armenia dearly Elchin Jafarov " Azerbaijan"
6. The great historical victory is a celebration of national salvation Vasif Hasanov Deputy Chairman of the Youth Union of the YAP Aghdam District Organization


Göndərilib: 08.07.2021 Qəbul edilib: 20.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/32-38

**Aygün İlham qızı Əliyeva**
Gəncə Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru, dosent
aygun.alizade1985@yahoo.fr

# DAHİ AZƏRBAYCAN ŞAİRİ VƏ MÜTƏFƏKKİRİ NİZAMİ GƏNCƏVİNİN YARADICILIĞINDA DÜNYƏVİ VƏ HƏMİŞƏMÜASIR ÇAĞIRIŞLAR

***Açar sözlər:*** *Nizami Gəncəvi,"Xəmsə", Peyğəmbərin tərifi, Peyğəmbərin meracı, Volter, A.Masse, P.L.Krua, Fransua Şarmua*

## Secular and ever-modern challenges in the work of great Azerbaijani poet and thinker Nizami Ganjavi

**Summary**

The article deals with the reasons for the need of studing creativity of Nizami Ganjavi on a global scale, analyzes the ideas and thoughts that cover all areas of life, that are relevant for all periods in his poems. Beginning from the first information described in the work of "Oriental Library", which was written by Bartelemy d`Herbelo in the XVII century, the author investigated and analyzed the researches and works related to Nizami Ganjavi`s creativity such as translation of "Seven Beauties" by Clerombl in 1741, Silvestr de Sasi in the XIX century, Lucien Buva, Alfons Russo, Henry Masse, Louis Aragon in the XX century and commented on their studies.

***Key words**: Nizami Ganjavi "Khamsa", Definition of the Prophet, The Miraj of the Prophet Muhammed, Voltaire, Henri Masse, P. L.Krua, François- Bernard Charmoy*

## Giriş

Dahi Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvi bəşəriyyətin bədii fikir tarixində nadir bəşəri ideyaların yaradıcısı və çarçısı kimi qalmışdır. Onun yaşadığı cəmiyyətə, dövrün hakimlərinə yönəlmiş haqqa və ədalətə söykənən çağırışları, bərabərlik, azadlıq və əməksevərlik hisləri aşılayan nəsihətləri, tolerant və azad cəmiyyət haqqındakı düşüncələri əsrlər keçdikcə daha da aktuallaşır.

Nizami Gəncəvinin böyük şöhrət qazanmış "Xəmsə"si dünya poetik-fəlsəfi fikrinin zirvəsində dayanır,onun yaradıcılığı dünya ədəbiyyatının nadir inciləri sırasında layiqli yerini inamla qoruyub saxlayır. Gəncə şəhərində yaşayıb yaratmış bu böyük söz və fikir ustadının yaradıcılığı doqquz əsrdir ki, özünün bəşəri təsir dairəsini durmadan genişləndirir.

Təsadüfi deyildir ki, YUNESCO tərəfindən Nizami Gəncəvinin yaradıcılığı bəşəriyyətin mədəni sərvəti kimi qiymətləndirilmişdir. Əsrlərdir ki, xalqımızı, indi isə həm də müstəqil Azərbaycanımızı şöhrətləndirən filisof şairimizin 880 illik yubileyi ilə əlaqədar Azərbaycan Respblikasının Prezidenti İlham Əliyev 05 yanvar 2021-ci il tarixli sərəncamı ilə 2021-ci il "Nizami Gəncəvi ili" elan etmiş,böyük mütəfəkkir şairin anadan olmasının 880 illiyinin Azərbaycanda və dünyanın böyük mədəniyyət mərkəzləri hesab edilən şəhərlərdə və ölkələrdə qeyd edilməsi təmin olunmuşdur.

Nizami Gəncəvi yaradıcılığının dünya miqyasında öyrənilməsini və təbliğini zəruri edən səbəb onun poemalarında həyatın bütün sahələrini əhatə edən və bütün dövrlər üçün aktual olan fikir və ideyaların irəli sürülməsi, yaratdığı bədii surətlərin dili ilə həm yaşadığı dövrün eybəcərliklərini çəkinmədən işıqlandırılması, həm də işıqlı gələcəyi haqqa, ədalətə

tapınmaqda görən çağırışlar edilməsidir. Böyük şair təkcə sirlər dolu dünyanın problemlərinə toxunmaqla kifayətlənmir, ayrı-ayrı obrazların dili ilə bu problemləri tənqid və təqdir edir. Təsvir olunan hadisələr orta əsrlərin xarakterik xüsusiyyətlərini tərənnüm etsə də böyük şair ustalıqla bu problemləri ümimiləşdirir, onları gündəlik həyatın adi cansıxıcı hadisələrindən ayıraraq qloballaşdırır. Ona görə də oxucu bu situasiyalarla tanış olarkən üzərindən doqquz əsr keçməsinə baxmayaraq müasir cəmiyyətin də oxşar problemlərlə yaşadığını anlayır və çıxış yolunu yalnız böyük söz və fikir ustadı Nizaminin çağırışlarına əməl olunmasında,haqqa tapınmaqda görür. Nizamişunas alim Xəlil Yusiflinin tərcüməsində şair "Sirlər xəzinəsi"ndə deyir:

İndi ədalətdən,aman,yox soraq,
Qaçmış o, simurğa aparmış pənah.
Mavi bu çardaqda abır yox daha,
Əsla bu torpaqda görünmür həya.
Qalx, Nizami, yaş axıt sən yenə,
Qan yaşı səp qanlar olan qəlbinə (1,s.13).

Bu misralar bizə indiki ədalətsiz dünyada hələ də aç-yalavac, xəstə halda yaşayan uşaqları, varlanmaq üçün bəşəri amalları çəkinmədən qurban verən harın insanları və müxtəlif bəhanələrlə müharibələr aparıb qanlar tökən dövlətlərin pərdələnmiş siyasətini xatırladır. Bu misralar xalqımızın Qarabağ məsələsində 30 il müddətində üzləşdiyi böyük dövlətlərin apardığı ikili siyasətinin acı nəticələrini, fikir və söz azadlığını özünün əsas şüarı elan etmiş bu böyük güclərin islamafobiyaya məruz qoyduqları İraq, Misir, Liviya və Suriya xalqlarının bu günki vəziyyətini bir daha yada salır. Doqquz əsr əvvəl bu hadisələrin günahkarı səlib yürüşlərini təşkil edənlər olmuşdusa, indi isə onların müasir varisləridir. Deməli, doqquz əsr ərzində dəyişən yalnız formadır, hadisələrin mahiyyəti isə dəyişməyibdir. Böyük Nizami demişkən, sonsuz kainatda bir çardaq ölçüdə olan yerin, torpağın öz həyasını itirməsi həqiqətən ağlamalı durumdur. Bu fikirlər sanki bu günümüz üçün deyilmişdir. Nizaminin dünya üçün qəbul edilən böyüklüyü də bundadır.

Nizami Gəncəvi bu ədalət axtarışında həm böyük yaradana, həm də tanrının sonuncu peyğəmbər kimi seçdiyi Məhəmməd səlallahuəleyhivəsəlləmə və ona göndərilmiş müqəddəs "Quran"a tapınır. Təsadüfi deyildir ki, şairin bütün poemaları tanrını və yaradılışı dərk etməklə, sonuncu peyğəmbərin tərifi və peyğəmbərin meracının təsviri ilə başlayır, o, insan övladının bəd əməllərdən xilasını bu müqəddəslərə tapınmaqda görür.Şair "Sirlər xəzinəsi" poemasının girişində insanlara müraciətlə deyir:

Bismillah irrəhman irrəhim
Oldu xəzinə açarın,ya həkim.
Haqq adı fikrin önü, həm söz sonu,
Qurtar adıyla sözü, yad et onu (1, s.19).

Şair "Xosrov və Şirin" poemasında özünü Allah bilən, dünya nemətlərindən gözü doymayan hakimlərə üzünü tutur:

Özündə axtarma Allahlığı sən,
Yüksəkdir o, şahlıq və hakimlikdən.
"Yox ol" desə hər şey birdən məhv olar,
Odur varlıqlara yenə səbəbkar.
Torpağı ölçən vaxt bir tük götürməz,
Küləyə əmr etsə ətrin gətirməz.
Əhsən bu qüdrətə, hər kəsə bir-bir
İbrətli işləri açır, göstərir" (2, s.159).

Nizami Gəncəvi "Sirlər xəzinəsi" poemasının "Peyğəmbərimizə dördüncü gözəlləmə"sində könlündə haqdan savayı bir diləyi olmayan Məhəmməd peyğəmbəri insanlığa nümunə göstərir, bəd əməllərdən xilas yolunu onun kimi yaşamaqda görür:

Dünya-ölüm, qan yurdu. Son qoy bu afətə sən,
Mərd əlini uzat, tut hamımızın əlindən.
Könlündə haqdan savay məgər bir dilək varmı?
Sənə qovuşan kəslər başqa bir şey umarmı?
Nizami ruhu səndən xoş xəbər gözləməkdə,
Sənin baharın onun könlünü süsləməkdə.
Vəfa qoxusu göndər mənə gül nəfəsindən,
Bəxş et bir dilənçiyə Süleyman mülkünü sən (3, s. 25).

Nizami Gəncəvi insanı böyük yaradanın ən mükəmməl məhsulu hesab etdiyindən yaradıcılığında insan amilinə xüsusi önəm verir. Onun yaratdığı surətlər insanların malik olduğu ən nadürüst və ən müdrik, ülvi xüsusiyyətləri özündə əks etdirir. Bütün poemalarında insan amili ön plana çəkilir. Bu mənada onun dördüncü poeması olan "Yeddi gözəl" xüsusi əhəmiyyət kəsb edir. Bu poema Sasani hökmdarı V Bəhramın hakimlik dövrünü əks etdirsə də şairin məqsədi heç də şahın həyatını tərənnüm etmək olmamışdır. Şair hökmdar Bəhramın simasında həmin dövrün mükəmməl təsvirini yaratmış, cəmiyyətin necə idarə olunması, hakim və onun əməlləri, cəmiyyətdə sadə insanın yeri, onun baxışı və istəklərini göstərmiş, ibratamiz hekayələrlə insana nəsihətlərini vermiş, onun qarşısına tələblər qoymuşdur. Nizami günəşə bənzətdiyi insanın xislətində var-dövlət hərisliyinin olmasını onun ən böyük düşməni hesab edir,cəmiyyətdəki mövqeyindən asılı olmayaraq insanları özünü dərk edən və dərk etməyənlərə bölür.

Xəlil Rza Ulutürkün tərcümə etdiyi "Sirlər xəzinəsi" poemasındakı "İnsanlıq mərtəbəsinin bütün xilqətlərdən üstünlüyü" bölməsində Nizami deyir:

Boş sevdadan əl üzmək-böyüklük əlaməti,
Nəfsi ram edə bilmək –peyğəmbərlik qüdrəti.
Təslim eyləyə bilsən nəfsini iradənə,
Öz mülkün bil cənnəti, halaldır cənnət sənə.
Həqq əhlinin gözündə həqq nuru var, göz yetir,
Həqqin nuru hər kəsə nicat verən zirehdir (3, s. 90).

Bu məqalədə Nizami Gəncəvi yaradıcılığının dünya miqyasında öyrənilməsini və təbliğini zəruri edən səbəblər araşdırılmış, söz və fikir dəryası Nizaminin poemalarından gətirilmiş nümunələrdən doğan bəşəri fikirlərin bu gün də öz aktallığını saxladığı əsaslandırılmışdır. Təsadüfi deyildir ki, bu gün beynəlxalq miqyasda apardığı uğurlu humanist fəaliyyəti ilə böyük nüfuz qazanmış, Nizami Gəncəvinin fikir və ideyalarını özünün ideoliji fəaliyyətinin əsası hesab edən Beynəlxalq Nizami Mərkəzi məhz bu böyük söz ustadının adı ilə dünyada sülhün və əminamanlığın qorunması uğrunda mübarizə aparır. Başqa sözlə, Nizami Gəncəvi indi dünyada haqqın, ədalətin bərpasında dünya xalqlarını birləşdirəcək simvol kimi qəbul edilir.

Bəs, Nizami Gəncəvi Avropada nə vaxt və necə tanınmağa başlamışdır? Qeyd etmək lazımdır ki, Avropa ədəbiyyatşünaslığında Şərq mövzularına həmişə müraciət olunmuş, bu sırada Nizami Gəncəvi yaradıcılığına maraq xüsusi yer tutmuşdur. Fransız ədəbiyyatında Nizami Gəncəvi yaradıcılığının öyrənilməsini araşdıran Azərbaycan ədəbiyyatşünaslarının tədqiqatları belə deməyə əsas verir ki, Gəncəvi Nizaminin həyat və yaradıcılığı ilə məşğul olan ilk avropalı şərqşünaslar məhz fransızlar olmuşdur.

Araşdırmalar göstərir ki, XVII əsrdə Bartelemi d'Herbelo (1625-1695) Şərq xalqları haqqında yazdığı "Şərq kitabxanası" əsərində Nizami Gəncəvi haqqında ilk məlumatları fransız ədəbi cəmiyyətinə çatdırmışdır. Onun yarımçıq qalmış bu əsəri Antuan Qallan (1646-1715) tərəfindən tamamlanmış, müəlllif daha sonra "Şərq antologiyası" əsərində Nizami yaradıcılığı haqqında daha geniş məlumatlar təqdim etmişdir.

XVlll əsrdə yaşamış şərqşnas ədib İ.L.Klerembol isə 1741-ci ildə Nizami Gəncəvinin "Yeddi gözəl" poemasını bütövlükdə fransız dilinə çevirmişdir.

XlX əsrdə Fransada Şərq mövzularının, xüsusilə şərq ədəbiyyatının və onun görkəmli nümayəndələrinin yaradıcılığının öyrənilməsi o qədər nüfuzlu bir araşdırma sahəsi hesab edilmişdir ki, fransız ədəbiyyatında bütün dövrlərin məşhur ədəbi siması olan Viktor Hüqo və Alfons de Lamartin kimi simalar da bu mövzularda sanballı ədəbi nümunələr yaratdılar. Məhz bu illərdə Parisdə Şərq dilləri məktəbinin ərəb və fars bölmələrinə rəhbərlik etmiş Silvestr dö Sasi (1758-1838) 1769-cu ildə nəşr etdirdiyi "Müasir klassiklərin kitabxanası"əsərində, onun tələbəsi, Firdovsinin "Şahnamə"sini fransızcaya tərcümə etmiş Jül Mol (1800-1876) öz məqalələrində Nizami Gəncəvi haqqında fransız cəmiyyətində olan məlumatları daha da genişləndirdilər.Daha sonra Parisdə Ali Elmi Tədqiqatlar Məktəbinin fars dili müəllimi Jan Darmsteter (1849-1894) "Fars şerinin mənşəyi"əsərində, Lüsyən Bouva (1872-1942) "Fars poeziyası"əsərində, Alfons Russo (1820-1870) "Şərq parnası və ya qədim və müasir şərq şairlərinin tarixi lüğəti" əsərlərində fars şerinin görkəmli nümayəndələri və Nizami Gəncəvi yaradıcılığı haqqında öz düşüncələrini fransız oxucuları ilə bölüşmüşdülər. XIX əsrin əvvəllərindən başlayaraq Parisdə nəşr olunan "Jurnal Aziatik" və "Rövu du monde müzülman" jurnalları fransız elit cəmiyyətində Şərq ədəbiyyatına olan marağı nəzərə alaraq Nizami Gəncəvinin təbliğinə xüsusi diqqət göstərmiş, bu jurnalların müxtəlif nömrələrində Alfonse Russo (1820-1870), Teofil Qotye (1811-1872) və 1829-cu ildə "İsgəndərnamə"nin bir hissəsini fransızcaya tərcümə etmiş Fransua Şarmuanın (1793-1868) Nizami Gəncəvinin yaradıcılığından bəhs edən məqalələri dərc edilmişdir. Bu məqalələrdə şairin Xll əsrdə söylədiyi fikirlərin və mütərəqqi dünya baxışlarının üstünlükləri və əhəmiyyəti qiymətləndirilmişdir.

XX əsr fransız ədəbiyyatının görkəmli nümayəndələri Anri Masse (1886-1969) və Lui Araqon (1897-1982) böyük Azərbaycan şairi və filosofunun yaradıcılığının milli və beynəlmiləl motivlərinin əhəmiyyətini fransızlara təqdim etməyə çalışmışdır. Anri Masse şairin "Xosrov və Şirin", İ.Klerembol isə "Yeddi gözəl" poemalarını bütövlükdə fransız dilinə çevirmişdir.

Fransız ədəbiyyatında Nizami Gəncəvi yaradıcılığına münasibətdən danışarkən XX əsr fransız ədəbiyyatının ən tanınmış nümayəndələrindən biri olan Lui Araqonun "Şərq ədəbiyyatı" adlı monoqrafiyasını xüsusi qeyd etmək lazımdır. L.Araqon bu əsərinin bir bölməsini "Nizami Gəncəvi" yaradıcılığına həsr etmişdir. Hər şeydən öncə onu vurğulamaq lazımdır ki, fransız ədibi digər həmvətənlərinin əksəriyyətindən fərqli olaraq Nizamini fransız oxucularına məhz Azərbaycan şairi kimi təqdim edir. Hətta Lui Araqon yazır ki, "bəşəriyyətə Nizami Gəncəvi kimi (İlyas Yusif oğlu Zəki Müəyyəddinin nəvəsi) bir dahi vermiş xalq hər cür ehtirama layiqdir. Nizaminin "Xəmsə"si dünyada latın və yunan dillərində yazılmış poemalardan daha geniş yayılmışdır" (4, s. 96).

Lui Araqon Y.E.Bertelsin 1946-cı ildə Nizami "Xəmsə"sinə yazdığı müqəddiməyə əsaslanaraq deyir ki, Nizami öz dövründə Gəncədə fəaliyyət göstərən "Əxi qardaşlıq" cəmiyyəti ilə sıx əlaqədə olmuşdur. Araqon Azərbaycanın XII əsr tarixinə münasibət bildirərək yazır ki, "XII əsr bizim Fransada Qüstav Köenin ifadəsi ilə desək, orta əsr ədəbiyyatının gənc dövrü olduğu halda Azərbaycanda XII əsrdə elə bədii əsərlər

yaranmışdır ki, onlar indi geniş miqyasda çiçəklənməkdə olan bir ədəbiyyatın əsasını təşkil edir" (4, s.101).

Lui Araqonun bu əsəri vasitəsilə Nizaminin fransız müasirləri olan Aleksandr dö Bernay, Lamber Lö Tor, Bernua dö Narmand, Mari dö Frans və Jan Bodel Arrasla tanış oluruq. L.Araqon bu əsərində Nizami ilə onların mənəvi yaxınlığından söhbət açır və qeyd edir ki, Nizami əxilər təşkilatının üzvü olduğu kimi onun fransız müasirləri də "Əxilər" təşkilatına bənzər "Taxta başmaq geyənlər" təşkilatının üzvləri idilər (4, s.101).

Sual oluna bilər ki,hansı səbəblə biz Nizami Gəncəvi yaradıcılığına fransız ədəbiyyatında maraq göstərilməsi məsələsi üzərində bu qədər dayandıq? İmkan daxilində ən vacib məqamları nəzərə çarpdırmağı lazım bilirəm.

Nizami Gəncəvi yaradıcılığına fransız ədəbiyyatında maraq göstərilməsinin başlıca səbəbi ondan ibarətdir ki, məsələ təkcə dahi Azərbaycan mütəfəkkirinin yaradıcılığına fransız şərqşünas alimlərinin, yazıçı və şairlərinin münasibətilə bitmir. Nizami əsərləri Avropa ölkələrinin ədəbiyyatına, eləcə də onun avanqard qolu olan fransız ədəbiyyatına güclü təsir etmiş və bu təsir altında həm Avropa, həm də fransız ədəbiyyatında Şərq mövzusunda qiymətli ədəbi nümunələr yaranmışdır. Fikri əsaslandırmaq üçün bəzi faktlara müraciət etmək lazımdır.

Fransız ədəbiyyatında öz əksini tapmış şərq mövzularından və ya bu mövzuların fransız ədəbiyyatına təsirindən danışarkən fransız şərqşunası Peti dö La Krua haqqında məlumat vermək lazım gəlir.

Fransız şərqşünası Peti dö La Krua (1622-1695) şərqlə dərindən maraqlanaraq bir çox əlyazmalar toplamış, həm də "Fransız-türk" və "Türk-fransız" lüğətinin müəllifi kimi Avropada şöhrət qazanmışdır. Tədqiqatçının oğlu Fransua dö La Krua da (1653-1713) atasının təsiri altında şərqşünaslıqla məşğul olmuş, XVII əsrdə Fransada bir şərqşünas kimi məşhurlaşmışdır .

Peti dö La Krua toplayıb nəşr etdirdiyi ədəbi nümunələrdə Nizami Gəncəvinin poemalarından götürülmüş hissələri müxtəlif formalarda fransız oxucusuna təqdim etməyə çalışmışdır. O, 1707-ci ildə "Türk nağılları"nı, 1710-1712-ci illər arasında isə Parisdə "İran nağılları"adı altında "Min bir gündüz "nağıllarını nəşr etdirmişdir ki, bunun da dördüncü nağılı Nizami Gəncəvinin "Yeddi gözəl" poemasındakı "Xeyir və şər" hekayəsindən ibarətdir (5, s.314).

Peti dö La Kruanın "Min bir gündüz" nağılları içərisində tərcümə olunmuş Nizaminin "Yeddi gözəl" poemasındakı "Xeyir və Şər" hekayətinin Volterin "Zadiq, yaxud Tale" povestindəki "Paxıl" novellasına təsiri də diqqəti cəlb edir. Əsgər Zeynalovun "Şərq Volter yaradıcılığında" monoqrafiyasından bəlli olur ki, xeyir şəri məhv etmək üçün fürsət gəzdiyi kimi Arimaz da Zadiqi məhv etməyə bir imkan axtarır. Nəhayət, onların gözlədiyi an gəlib çatır. Birində vasitə su, digərində isə kağız parçası olur. Şər su vermək adı ilə Xeyirin gözlərini çıxardır. Arimaz isə Zadiqin cırıb atdığı kağızın bir parçasını aparıb şaha verməklə öz rəqibini çətin vəziyyətə salır. Tale onların hər şər qüvvələrin üzərində qalib edir. Tədqiqatçının göstərdiyi kimi əgər Xeyiri canlı insan-qız xilas edirsə, Zadiqi kağızın ikinci parçasını tapıb gətirən tutu quşu xilas edir. Nizamidə isə göstərilir ki, qız oğlana iki sırğa göndərir. Oğlan isə üçünü əlavə edib geri qaytarır. Bunların mənası sonra açılır." Onu başa saldım ki, ömür iki günlükdür, başa düş. O isə ikisinə üçünü artırıb dedi: "Əgər beş də olsa tez keçib gedər" (7,s.73).

Nizami süjetləri XVIII əsr Avropa ədəbiyyatında dramaturgiyaya da öz təsirini göstərmişdir. Araşdırmalardan məlum olur ki, Nizami motivləri əsasında səhnə əsəri yaradılması ilə ilk dəfə fransızlar məşğul olmuşdur. Sankt-Peterburqun "Muzika" nəşriyyatı

tərəfindən nəşr olunmuş "Yüz opera" kitabının 1993-cü səhifəsində yazılır: "Turandotun süjeti XII əsr Azərbaycan şairi Nizaminin poemasında verilmişdir.Müxtəlif Avropa ölkələrinin XVIII əsrdə tərtib etdikləri "İran nağılları" kitabında da Nizami süjetləri öz əksini tapmışdır" (5, s.316).

Nizami yaradıcılığına müraciət edən fransız sənətkarlarından biri də Alen Röne Lesajdır (1668-1747). Alen Röne Lesaj Fransua Peti dö La Kruanın "İran nağılları" kitabında Nizaminin nağıl kimi nəşr olunmuş "Yeddi gözəli"nin dördüncü novellasının "Xeyir və Şər" nağıllarını opera üçün işləmiş, "Çin şahzadəsi" adlı kiçik həcmli opera mətnini yazmışdır. Bu fakt belə nəticəyə gəlməyə əsas verir ki, Lesaj yuxarıda adı çəkilən opera mətnlərini bilavasitə Nizaminin "Yeddi gözəl" əsərindən bəhrələnərək yazmışdır. Opera 1723-cü ildə Parisdə "Komedi Fransız" teatrında göstərilmişdir (5, s.316).

Qeyd etmək lazımdır ki, ilk dəfə fransız səhnəsinə qədəm qoyan Nizami süjetləri sonralar italyan və alman səhnələrinə də yol tapmışdır. İtalyan dramaturqu Karlo Qotsi "Teatr üçün nağıllar" toplusunu və "Turondot"u, alman şairi və dramaturqu Y.X.F.Şiller "Turandot şahzadəsi" əsərlərini Alen Röne Lesaj kimi Gəncəli Nizaminin "Yeddi gözəl" əsərindəki "Xeyir və Şər" nağılı əsasında qələmə almışdır .

Nizami Gəncəvinin yaradıcılığını tədqiq etmiş və ondan öz əsərlərində bəhrələnmiş fransız ədiblərindən biri də Lui Araqondur. "Elzanın dəlisi"("Le fou d'Elza") kitabının təhlili göstərir ki,Nizami yaradıcılığının öyrənilməsinə xüsusi diqqət yetirmiş L.Araqonun sevgilisinə həsr etdiyi bu poema ideya və məzmun baxımından elə "Leyli və Məcnun" dastanıdır. Təsadüfi deyildir ki, tədqiqatçı Ə.Sərkaroğlu Lui Araqonun Elzaya həsr etdiyi şeirlərə münasibətini bildirərək yazır ki, o, Nizaminin Məcnununun söylədiyi aşiqanə şeirlərdən təsirlənərək özünün ömür gün yoldaşı Elza Trioleni Leyli, özünü isə ona çılğıncasına vurulmuş eşq divanəsi kimi, öz Leylisinin Məcnunu kimi təsvir etmişdir (6, s.381).

Görkəmli fransız ədibi və şərqşünası Anri Massenin tərcümələrində də Nizami Gəncəvinin yaradıcılığına olan maraq xüsusilə diqqət cəlb edir. 1880-1969-cu illərdə yaşamış Anri Masse uzun illər Parisdə müasir Şərq dilləri məktəbinin direktoru vəzifəsində çalışmışdır. Anri Masse 1950-ci ildə Parisdə "Fars antologiyası (XI-XIX əsrlərdə)" kitabını çap etdirmişdir. Antologiyada Azərbaycan şairi Gəncəli Nizamiyə həsr olunmuş xüsusi fəsil vardır. Müəllif həmin fəsildə yazır ki, "Bu böyük şairin həyatı az öyrənilmişdir. O, 1140-ci ildə Gəncə şəhərində anadan olmuş, 1209-cu ildə elə orada vəfat etmişdir" (7, s.373).

A.Masse Nizami yaradıcılığından aşağıdakıları fransız dilinə çevirmişdir:

"Leyli və Məcnun"dan – "Zeyidin yuxuda Leyli və Məcnunu behiştdə görməsi", "Mərd padşah və quduz itlər", "Sirlər xəzinəsi"ndən "Sultan Səncər və qarı" hekayəti, "Zülmkar padşah və düz danışan kişinin hekayəti","Kərpickəsən qocanın bir çobanla hekayəti", "Yeddi gözəl" dən – "Bəhramın ov məharəti".

Anri Massenin tərcümə yaradıcılığının ən yüksək zirvəsi isə şübhəsiz ki, Nizami Gəncəvinin "Xosrov və Şirin" poemasının bütöv tərcüməsidir. "Xosrov və Şirin" poemasının fransız dilində tərcüməsi fransız şərqşünasının ölümündən bir il sonra -1970-ci ildə nəşr olunmuşdur.

## Nəticə

Poemalarında dünyaya müdriklik, ədalət, sülh, əməksevərlik və söz azadlığı kimi ali ideyalar təbliğ edən Azərbaycanın mütəfəkkir şairi Nizami Gəncəvinin yaradıcılığı dünya durduqca öyrəniləcək, xalqların ədəbi xəzinəsində layiqli yerini tutacaqdır. Təsadüfi deyildir ki, bu gün beynəlxalq miqyasda apardığı uğurlu humanist fəaliyyəti ilə böyük

nüfuz qazanmış, Nizami Gəncəvinin fikir və ideyalarını özünün ideoliji fəaliyyətinin əsası hesab edən Beynəlxalq Nizami Mərkəzi məhz bu böyük söz ustadının adı ilə dünyada sülhün və əminamanlığın qorunması uğrunda mübarizə aparır. Başqa sözlə, Nizami Gəncəvi və onun yaradıcılığı indi dünyada haqqın, ədalətin bərpasında dünya xalqlarını birləşdirəcək nümunə kimi qəbul edilir.

## References

1. Nizami Ganjavi. «Treasury of Mysteries» Translated by Khalil Yusifli. Baku, Adiloglu Publishing House
2. Nizami Ganjavi. Khosrow and Shirin. Translated by Khalil Rza Uluturk, East-West Publishing House 2012
3. Nizami Ganjavi. Treasury of Mysteries. Translated by Khalil Rza Uluturk, East-West Publishing House 2012
4. Isamayılov R.Azerbaijan-France literary relations. Baku. Azerbaijan National Encyclopedia 2001, 349 p.
5. Sarkaroglu A. The prophetic poet of Azerbaijan. I c. Baku: Science, 2004, 60 p
6. Sarkaroglu A. Nizami in French sources, Baku. Azerbaijan State Publishing House, 144 p.
7. Zeynalov A. East in the works of Voltaire. Azerbaijan National Encyclopedia Publishing House. 2001, 160 p.
8. Voltaire. Zadig, Paris, Librairie Générale 1987, 537 p.
9. Luis Aragon. Elsa's eyes.Seghers- Poésie d`abord.2012, 168 p.
10. Henri Massé. Translation. Nizami. Khosrow and Shirin. G- P Maison neuve and Larose. 1970.

Göndərilib: 08.07.2021 Qəbul edilib: 22.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/56-60

**Teybə Aslan qızı Əfəndiyeva**
ADPU Şamaxı filialı
müəllim
efendiyevateybe1962@gmail.com

# MÜASUR DÖVRDƏ AİLƏNİN İNKİŞAF DÖVRLƏRİNİN PSİXOLOJİ PROBLEMLƏRİNİN ÖYRƏNİLMƏSİ

***Acar sözlər***: *İnkişaf, psixologiya, problem, ailə, sosial, sistem, münasibətlər, daxili, rollar*

## The study of psychological problems of developmental stages of the family in modern times

**Summary**

The family is an integral part of society. More precisely, the family can be called the primary social group. We know that the family is a key component of the social structure of any society, performs various social functions and plays a key role in the development of society. As the society developed socio-economically and culturally in the ups and downs of the historical process, the family developed along with it and gained new features. Let's look at some definitions of the family in modern encyclopedias and dictionaries: The family is a small group based on marriage or blood relationship. Its members are connected to each other by domestic unity, mutual moral responsibility and mutual assistance. The innovations of each stage of family development, the immediate development zone and the possible forms of fixation or regression in the family development are all given in separate stages of development. The highlighted stages not only reflect the social changes in the family, but also the changes in life goals, values and social roles of family members through their prism.

***Keywords:*** *Development, psychology, problem, family, social, system, relationships, internal, roles*

İnsan fəaliyyətinin elə bir sahəsi yoxdur ki, psixologiya elmi ora nüfuz etməsin, ondan düzgün və yerində istifadə edildikdə yüksək nəticələr verməsinə nail olmaq olar. Heç bir cəmiyyət (heç bir şəkildə mədəni) ailə olmadan inkişaf edə bilməzdi, yaxın gələcək də onsuz təsəvvür edilə bilməz: ailə unsanların sosial-psixoloji inkişaf mühütidir və sivilizasiyanın yaradıcısıdır.

Metaforik olaraq ailəni öz qanunlarına görə inkişaf edən bir orqanizm kimi görmək olar. Ailə bir orqanizm olaraq doğulur, inkişaf edir və ölür. Onun inkişafı müəyyən mərhələlərdən keçir. Ailə, hər hansı bir canlı sistemi kimi, iki əks istiqamətə yönəlmiş meyl ilə xarakterizə olunur: inkişaf, yəni dəyişiklik istəyi və durğunluq istəyi, yəni ailənin əldə etdiyi quruluşu qorumaq istəyi.

Cəmiyyətin təkamülünün ayrı-ayrı mərhələlərində ailənin strukturunda, funksiyaları və ailə münasibətlərinin xarakterində əhəmiyyətli dəyişikliklər baş vermişdir. Bu dəyişikliklər ibtidai insan şürüsü üçün səciyyəvi olan prosmiskuitetdən (ibtidai insan cəmiyyətinin aşağı pilləsində cinsi əlaqənin tamamilə nizamsız olması), qrup nigahı, matriarxat, patriarxat və monoqamiyaya qədər milyon illər davam edən təkamül yolu keçmişdir. Cəmiyyətdə baş verən ictimai tərəqqi və təkamül ailəni də ən bəsit, ibtidai formalarından tədricən yüksək, ali təşkilati formalara yüksəltmişdir. Etnoqrafik mənbələrə istinad edərək bəşər tarixinin öz inkişafında keçmiş olduğu üç əsas mərhələni –vəhşilik, barbarlıq və sivilizasiyanı

fərqləndirmək olar. Bu mərhələlərin hər birində qadınla kişi arasındakı münasibətləri tənzimləyən müəyyən ictimai institutlar mövcud olmuşdur. Cəmiyyətin inkişafının ilkin mərhələlərində cinsi münasibətlərin nizamsız olması adi və səciyyəvi hal idi. Tayfanın meydana gəlməsi ilə insanlar arasında bu münasibətlər qrup nikahı normaları ilə tənzimlənməyə başlandı. Qrup şəklində yanaşı yaşayan kişilər və qadınlar “kommunal nikah” münasibətləri ilə bir-biriləri ilə sıx əlaqədə idilər. Belə həyat tərzində yaşayan hər bir kişi özünü bütün qadınların əri hesab edirdi. Bir çox etnoqraf alimlər qeyd edirlər ki, poliqam nikahlar dövründə fahişəlik açıq, monoqam nikahlar dövründə isə gizli xarakter daşımağa başlamışdır. Bir sıra cəmiyyətlərdə “dini fahişəlik” adlandırılan fahişəlik geniş yayılmışdı: qəbilə başçısı, keşiş və ya digər hakimiyyət sahibi gəlinlə ilk nikah gecəsini birgə keçirmək hüququna malik idi. İnsanlarda belə bir dini inanc hakim idi ki, ilk gecə hüququna malik olan keşiş ər-arvadlılığı müqəddəsləşdirmiş olur. Gəlinin ilk gecəni kralla birgə keçirməsi bir çox ailə quran gənclər üçün böyük şərəf hesab edilirdi. Fəlsəfə, sosiologiya, tarix, psixologiya, pedaqogika və etnoqrafiya sahəsində tədqiqatlar aparan mütəxəssislərin əksəriyyəti ailəyə canlı sosial sistem və ictimai orqanizm kimi yanaşırlar. Qədim filosof və mütəfəkkirlərin təsəvvürlərinə görə fərdlər arasında nikah və ailə, yəni kişi, qadın və uşaqlardan ibarət qrup həmişə mövcud olmuşdur. Bir çox mütəxəssislərin fikrincə, belə nikah və ailə insanın bioloji çoxalma instinkti ilə bağlıdır və belə ailə növü və institutlar insanlara canlı əcdadlarından keçmişdir. Bu qənaət, əlbəttə, doğru hesab edilə bilməz. Ailə və nikah heç də bioloji mahiyyət kəsb edə bilməz, onlar yalnız insan cəmiyyəti üçün xarakterik olan sosial təsisat və hadisələrdir. İnsanların bioloji olaraq çoxalması və “istehsalı” üçün nikah deyil, cinsi münasibətlər kifayətdir. Nikahı cinsi münasibətlərlə eyniləşdirmək olmaz, onlar fərqli münasibətlərdir. Cinsi münasibətlər, xüsusilə uşaqların doğulması nikah olmadan, nikahdan kənar da mümkündür. Nikah cinslər arasında münasibətlərin sosial təşkilinin xüsusi sistemidir. O, bu münasibətlərlə bir-birinə bağlanan tərəflərin müəyyən hüquq və vəzifələrinin məcmuyunu özündə əks etdirir. İnsanların sosial münasibətlərini əks etdirən cəmiyyətdən fərqli olaraq, heyvanlar aləmində cinslər arasında münasibətləri tənzimləyən normalar mövcud deyil. Ona görə də heyvanlar aləmində ailə münasibətlərini əks etdirən ailə və nikahdan deyil, ən yaxşı halda onların bioloji anologiyasından söhbət gedə bilər. Təkamül təliminə istinad əsasında deyə bilərik ki, insanların ən yaxın “qohumları” olan oranqutanlar nəslində erkək oranqutanlar tənha yaşadıqları halda, dişilər öz balaları ilə birgə yaşayırlar. Bu cəhət böyüyüb nəsilvermə yaşına çatan erkək oranqutanlar üçün də xarakterikdir. Qorilla və şimpanze sürülərində ailə mövcud deyil. Yalnız təkamüldə insanlardan geridə qalan bütün antropoidlərdən fərqli olaraq, hipbbonlarda erkək, dişi və balalardan ibarət qruplar yaranmağa başlamışdır. Lakin onlar vahid təşkilati formaya malik geniş birliklər şəklində həyat yaşamırdılar.

Müasir dövrdə əksər psixoloqlara irəlidəki ciddi problemlərin bir sabit vəziyyətdən digərinə, yəni inkişaf məqamlarına keçəndə ortaya çıxması ilə bağlı fikirlərlə bölüşürlər. Bu vəziyyəti böhran adlandırmaq olar. Ailə problemlərinin çoxu fərdi olaraq ailə üzvlərinin və yaxud bütövlükdə ailənin inkişafının yeni səviyyəsinə keçmək istəməməsindən irəli gəlir (Xeyli, 2001) [6].

Azərbaycan ailəsi və ailə məişəti haqqında mənbələrdə, yazılı abidələrdə və qaynaqlarda, XIII əsrin böyük Azərbaycan alimi Nəsirəddin Tusinin, müxtəlif dövrlərində yaşamış Azərbaycan ədəbiyyatı klassiklərinin əsərlərində, şifah xalq ədəbiyyatı inciləri olan dastanlarda dəyərli məlumatlar vardır. Azərbaycanlıların ailə və ailə məişətinə dair maraqlı materiallar XI-XVIII əsrlərə aid mənbələrdə də öz əksini tapmışdır. Azərbaycanda ailə və ailə məişəti məsələləri XVIII əsrin sonundan başlayaraq XIX əsr və XX əsrin başlanğıcında

yazılmış etnoqrafik səpkili rusdilli ədəbiyyatda da əks olunmuşdur. Həmin materialların müqayisəli təhlili aydın surətdə göstərir ki, Azərbaycanda orta əsrlərin ailə məişəti ilə yeni dövrün ailə məişəti arasında kəskin fərqlər olmamışdır, yəni Azərbaycan xalqının ailə məişətində varislik ənənələri müşahidə edilir. Deməli, Azərbaycan xalqı ailə və ailə məişəti ilə bağlı olan adət -ənənələrini əsrlər boyu qoruyub saxlaya bilmiş, onları təkmilləşdirmiş, inkişaf etdirmiş və bu ənənələr tarixin sınaqlarından keçərək zəmanəmizədək gəlib çatmışdır. Azərbaycan ailəsi dünyanın əxlaqi cəhətdən ən təmiz və möhkəm ailələrindən biridir. Ailə üçün səciyyəvi olan bu xüsusiyyətlərin dərin kökləri vardır. Həmin köklər Azərbaycan ailəsinin inkişaf yolu ilə bağlıdır. Dünyanın bütün xalqlarında olduğu kimi, azərbaycalılarda da tarixi inkişaf prosesində ailənin həcmi və strukturu ilə müəyyən edilən iki forması -böyük ailə və kiçik ailə mövcud olmuşdur. Böyük ailələr ailə icması, yaxud patriarxalailə, nəsli ailə, bölünməmiş, birləşmiş və ya mürəkkəb ailə və s. adlarla məlumdur. Ailə icması üç, dörd və bəzən beş nəslin nümayəndələrindən ibarət olub, ata, oğul, nəvə, nəticə və eləcə də qardaşların ailələrini birləşdirən kiçik ictimai kollektiv, təsərrüfat özəyi idi. Bu kollektivə onun ağsaqqalı başçılıq edirdi. Ailə icması üçün səciyyəvi cəhət onun üzvlərinin torpaqdan, əmək alətlərindən, ev heyvanlarından, digər mülkiyyət və əmlakdan birlikdə istifadə etməklə, birgə istehsal və birgə mənimsəmədir. Bu xüsusiyyətlər ailə icmasının təsərrüfat və ictimai mahiyyətini müəyyənləşdirməklə onun təbii əsasını təşkil edir. Görkəmli alimlər Ə.Əlizadə və A.Abbasov öz elmi işlərində qeyd edirlər ki, vaxtı ilə mürəkkəb ailə daha geniş yayılmışdır. Keçmiş zamanlarda belə ailəyə patriarxal ailə deyilirdi.... Mürəkkəb ailədə on-on iki, hətta bəzən daha çox uşaq olurdu... Bu ailədə hərənin-babanın, nənənin, atanın, ananın, böyük qardaşın, kiçik bacının öz yeri var idi:ailənin bütün həyatı bərqərar olmuş adət və ənənələrlə idarə olunurdu. Bu ailə həm “klub” və “məktəb”, həm də “doğum evi” idi, “poliklinika” və ya “aptek”, həm də özünəməxsus xarakter daşıyan “məhkəmə” idi” [1].

Ailə cəmiyyətin tərkib hissələrindən biridir. Daha dəqiq desək, ailəni ilkin ictimai qrum adlandırmaq olar. Bizə məlumdur ki, ailə hər bir cəmiyyətin ictimai sturkturunun əsas komponenti olub, müxtəlif sosial funksiyaları yerinə yetirir, cəmiyyətin inkişafında başlıca rol oynayır. Tarixi prosesin enişli-yoxuşlu yollarında cəmiyyət sosial-iqtisadi, mədəni cəhətdən inkişaf etdikcə ailə də onunla bərabər inkişaf etmiş, yeni xüsusiyyətlər qazanmışdır. Müasir ensiklopediya və lüğətlərdə ailəyə verilmiş bəzi təriflərlə tanış olaq: Ailə nikah, yaxud qan qohumluğuna əsaslanan kiçik qrupdur. Onun üzvləri bir-birinə məişət birliyi, qarşılıqlı mənəvi məsuliyyət və qarşılıqlı köməklə bağlıdır. Ailə bir-birinə məişət birliyi və qarşılıqlı məsuliyyətlə bağlı olan adamların nigah və ya• qan qohumluğuna əsaslanan birliyidir. Nəzərdən keçirdiyimiz təriflərdə ailəni səciyyələndirən iki mühüm xüsusiyyət: a) məişət birliyi; b) özünəməxsus münasibətlər sistemi, qarşılıqlı cavabdehlik, məsuliyyət və kömək ayırd edilir. Bu xüsusiyyətlər qarşılıqlı əlaqədədir. Ailəni xarakterizə edərkən onları birlikdə nəzərdən keçirmək lazımdır. Özünün bu məziyyətlərinə görə ailə bütün digər kiçik qruplardan (məsələn, dostlar dəstəsindən, birlikdə işləyən manqa üzvlərindən və s.) fərqlənir.

Müasir ailə daha aydın şəkildə özünü “psixoterapevtik birlik” kimi təsdiqləyir. Məqsəd ailə getdikcə unikal şəraitin yaradılması ilə əlaqələndirilir, buda həm həyat yoldaşları, həm də uşaqların özünü inkişaf etdirməsi və fərdi özünü dərk etməsi ilə bağlıdır. Tərbiyə valideynlər ilə bərabər əməkdaşlıq xarakteri alır, uşağın hüquqlarına hörmət və xüsusən də haqqının tanınmasına əsaslanaraq uşaqlar müstəqil bir həyat yolu seçməyə çalışırlar. İyerarxiyədə göstərilən dəyişikliklər ailənin funksional quruluşunu və onun tarixi inkişafının ümumi tendensiyalarını əks etdirir.

Bəzi ədəbiyyatlarda ailənin ayrılmaz bir sosial orqanizm kimi inkişafı məsələsi kifayət qədər işıqlandırılmamışdır. E.G.Eydemiller (1999) və A.V.Çernikovun (2010) monoqrafiyalarında bu məsələyə yalnız bir neçə səhifə həsr edilmişdir. Eyni zamanda S.Minuxin demişdir: "Bu gün texnikaları bilən, amma ailəni başa düşməyən bir çox ailənin psixoterapevtləri vardır [6].

Bəzən biz heyrətamiz işləri görürük və tamamilə yanılırıq, çünki üsullar sosial baxımdan konkret başa düşülən hala görə seçilmir, lakin psixoterapevtin "əlinin altında" olduğuna görə belə alınır (Saymon, 1996, s. 116). Əminik ki, ailəni başa düşmək və içində baş verən bütün prosesləri görmək üçün, bütövlükdə bir orqanizmdə olduğu kimi, onun inkişafının hansı mərhələsində, hansı istiqamətdə inkişaf etdiyini və bunun nəyə mane olduğunu və yaxud inkişafına nə mane ola biləcəyini aydın şəkildə anlamaq lazımdır [2;4].

Son zamanlar ailənin psixoterapiyasına dair kifayət qədər kitab yazılıb (Vitaker-1997; Minuxin, Fişman-1998; Şerman, Fredman-1998; Pepp-1998; Madanes-1999; Yustitskis-1999; Uorden-2005; Varga-2009; Eydemiller, Zolotarev-2012 vəbaşqaları), bunların əksəriyyəti ailənin psixoterapiyasının klassiklərinin təcrübəsini təsvir edir və ailə ilə işləmək üçün xüsusi texnika və üsulları təqdim edirlər [5;7].

Bu mövzunun öyrənilməsinin məqsədi- ailənin ontogenezin ayrılmaz sosial orqanizm kimi göstərməkdir, yəni onun inkişafında keçdiyi mərhələləri nəzərdən keçirmək və hər mərhələdə yarana biləcək ən tipik psixoloji problemləri müəyyənləşdirməkdir. Mövcud ədəbiyyatdan fərqli olaraq, ailədə baş verənlərə deyil, onun inkişaf istiqamətinə və inkişafına nə mane ola biləcəyinə xüsusi diqqət yetirəcəyik. Fikrimizcə, bunun aydın bir anlaşılması ailə psixoloqunun işini daha mənalı edir.

Ənənəvi - nüvə ailənin (yəni iki nəsildən ibarət bir ailə: həyat yoldaşları və uşaqları) inkişaf dövrünü nəzərdən keçirəcəyik.

Genişləndirilmiş ailə (yəni üç və yaxud daha çox nəsil olan ailənin həyat yoldaşlarının valideynləri, qardaşları, bacıları və digər qohumlarıda ola bilər), ailənin quruluşunun natamam və digər variantları, əlbəttəki, ailənin münasibətlərində öz izlərini buraxır, amma bütün əsas nümunələr ailənin sistem olaraq inkişafı qorunur.

Müasir psixoloji ədəbiyyatlarda ailənin ənənəvi, uşaq mərkəziyyətçi və ər-arvad (demokratik) olmaqla üç əsas psixoloji tipi fərqləndirilir. Ənənəvi ailədə yaşlıların nüfuzu yüksək tutulur və onlara qarşı hörmət hissinin tərbiyəsinə xüsusi diqqət yetirilir: pedaqoji təsir yuxarıdan aşağıya doğru həyata keçirilir, tabeçilik əsas tələb hesab olunur. Belə ailələrdə böyüyən uşaqların sosiallaşması gələcəkdə onların cəmiyyətin şaquli ictimai strukturlarına asanlıqla daxil olmasına təminat yaratmış olur. Onlar ənənəvi normaları asanlıqla mənimsəyir, lakin müstəqil olmadıqlarına görə öz şəxsi ailələrini yaratmaqda çətinlik çəkirlər. Onlarda təşəbbüskarlıq və çeviklik, ünsiyyət qurmaq bacarıqları zəif inkişaf edir [4;8].

Tədqiqatçılar uzun müddətdir ailənin inkişafını öyrənirlər. Hələ 1948-ci ildə, ailənin həyatı ilə əlaqədar konfransda, elm adamları E.Duvall və R.Xill "ailənin dövrü" termini təqdim etmişdilər. Lakin indiyə qədər ailənin inkişaf mərhələlərinin vahid təsnifatı mövcud deyildir. Belə bir təsnifata ən məşhur yanaşmalar Y.E.Alyoşinanın (1987) elmi araşdırma məqaləsində təsvir edilmişdir [3;4].

Ailənin inkişaf dövrünü izah edərkən, əsasən D.Xeyli və M.Eriksonun (2001) kitabında verilən Milton Eriksonun müşahidələrinə, həm də Y.E.Alyoşina (1987) tərəfindən irəli sürülmüş qanunauyğunluqlara və öz təcrübəmizə istinad edəcəyik.

Bütün tədqiqatçılar uşaqların olması və yaxud olmaması faktının və onların yaşlarının həyat yoldaşları arasındakı münasibətlərə böyük təsir etdiyi ilə razıdırlar; bundan əlavə, ailə həyatının "təcrübəsi" çox önəmlidir [2;8].

Sosial bir orqanizm olaraq ailədə baş verən dəyişiklikləri təhlil etmək üçün L.S.Vıgotskinin uşağın zehni inkişaf mərhələlərini təsvir etmək üçün təklif etdiyi kateqoriyalardan istifadə edilir. Ailənin inkişafındakı hər bir mərhələnin yeniliklərini, yaxın inkişaf zonası və ailənin inkişafında mümkün fiksasiya və ya reqressiyanın formaları ayrıca inkişaf mərhələlərində verilir.

Ailənin inkişaf mərhələlərini aşağıdakı kimi göstərmək olar:

- Ailənin yaranması. Diada mərhələsi;
- Uşağın doğuşu. Triada mərhələsi;
- Uşağın məktəbə getmə mərhələsi;
- İkinc iuşağın doğulması mərhələsi;
- Ailədə yeniyetmə və uşağın ailədən getməsi mərhələsi;
- Həyat yoldaşlarının yaşlılığı və təqaüdə çıxma mərhələsi.

Bu dövrləmə eklektikdir (qarışdurma, fərqli üslubların, fikirlərin, görüşlərin və s. birləşməsi). Ən çox bu nəzəriyyə, Dyuvalın təklif etdiyi təsnifata bənzəyir. Sistem meydana gətirən ailənin reproduktiv funksiyasına əsaslanır. Vurğulanan mərhələlər nəinki ailədəki sosial dəyişiklikləri əks etdirir, həmdə onların prizmasından ailənin üzvlərinin həyat hədəflərində, dəyərlərində və sosial rollarında dəyişiklikləri görmək mümkündür.

## References

1. Alizade AA Abbasov A.N. Family / Textbook for IX grades. Baku: Maarif, 1989, p.116-117.
2. Gurbanova L., Psychological problems of the family and solutions, Baku, 2018, 256 p.
3. Huseynov EA, Family psychotherapy, Baku, 2021, 242 p.
4. Aleshina YE, Family Development Cycle. Research and problems // Vestn. моск. un-ta. Sir. 14, Psychology. 1987. No2. c. 60-72.
5. Varga A.Ya., Systemic family psychotherapy, M .: Speech, 2001, 134 p.
6. Family psychotherapy / Sost. EG Eidemiller, NV Alexandrova, V. Justickis, St. Petersburg: Peter, 2000. 512 p.
7. Hailey J., Erickson M., Family Therapy Strategies. M.: In-t Obshchegumanit. research., 2001. 448 p.
8. Diane Gehart, Specialization in Family Therapy Enough, Translation Editors: Assoc. Dr. Tahsin İlhanYrd. Assoc. Dr. HüdayarCihan, 2017, Ankara, 605.s.

Göndərilib: 16.07.2021 Qəbul edilib: 23.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/61-72

**Maarif Vaqif oğlu Məmmədov**
Eskişəhər Osmanqazi Universiteti
doktorant
maarif.pdr@gmail.com
**Anar Müseyib oğlu Babayev**
Xəzər Universiteti
müəllim
anarmusasoy@yahoo.com

# KORONAVİRUS (COVİD-19) PANDEMİYASI DÖVRÜNDƏ 17 YAŞDAN YUXARI ŞƏXSLƏRİN PSİXOLOJİ VƏZİYYƏTLƏRİN İNCƏLƏNMƏSİ

***Açar sözlər:*** *koronavirus, COVID, psixoloji*

## Examining the psychological state of people over 17 years old during the coronavirus (Covid 19) pandemic condition

**Summary**

The purpose of this study is to examine the psychological state of people over 17 during the COVID-19 pandemic. Psychological studies of coronavirus have shown that it causes emotional disturbances such as anxiety, fear, increased stress and depression, and sleep and eating disorders in adults. In the light of these findings, the psychological situation of adults living in different regions of Azerbaijan during the coronavirus pandemic was analyzed. The findings are important in providing psychological support to adults during the coronavirus pandemic. The last part of the study contains recommendations for research to be conducted during the pandemic.

***Keywords****: coronavirus, COVID, psychological*

## Giriş

31 dekabr 2019-cu ildə Ümumdünya Səhiyyə Təşkilatı Çinin Vuhan şəhərində etiologiyası naməlum olan pnevmoniya ilə xəstələnmə halları olduğunu bildirmişdir. 2020-ci ilin yanvar ayının 7-də isə bu fakt daha əvvəllər insanlarda rast gəlinməmiş yeni bir koronavirus (2019 Novel Coronavirus COVID-19) olaraq təsdiqlənmişdir. Virusun qısa müddət ərzində dünyanın bir çox yerində yayılması ilə Ümumdünya Səhiyyə Təşkilatı 11 mart 2020-ci ildə pandemiya elan etmişdir. 17.07.21 tarixində Azərbaycan Respublikası Nazirlər Kabineti yanında Operativ Qərargahın məlumatına görə 338183 nəfər virusa yoluxub, 4991 nəfər insan həyatını itirib (https://koronavirusinfo.az/az/post/961).

COVID-19'un qısa müddət ərzində dünyanın fərqli yerlərinə yayılması, karantin rejiminin tətbiq olunması sadəcə səhiyyə sektoruna deyil, iqtisadi, sosial və psixoloji sahədə də fərdi və ictimai formada öz təsirini göstərməkdədir (Tönbül, 2020). İnsanların COVID-19 haqqında qeyri rəsmi məlumatları fərqli mənbələrdən alması onların psixoloji vəziyyətlərinə mənfi təsir edəcəyi bilindiyindən virusla əlaqəli doğru məlumatların verildiyi müxtəlif platformalar hazırlanmışdır (Dubey və dig., 2020, Depoux və dig., 2020). COVİD-19 ilə əlaqəli görülən işlər, yoluxma sayı, ölüm sayı, yoluxmanın qarşısının alınması üçün vacib məqamlar insanlara çatdırılmaqda, virusla aparılan mübarizənin qeyri dərman formalarından olan karantin, sosial izolyasiya, gigiyenik qaydalara riayət olunması mütəmadi olaraq elan olunmaqdadır. Bununla yanaşı virusla əlaqəli qeyri müəyyənliklər,

ölkələrin əksər sahələrindəki fəaliyyətlərin dayandırılması, xəstəliyin nə qədər davam edəcəyi, hansı müddətdən sonra kontrol altına alınacağı və virusun riskinin hələ də davam etməsi, nəzarətin insanın öz əllərində olmaması kimi faktorlar müxtəlif inkişaf mərhələsində olan şəxsləri narahat etməkdədir və bu stresə, təşvişə səbəb olmaqdadır (Brooks və dig., 2020). Yetkin şəxslərdə xəstələnmək, ölüm, yaxınlarını itirmə qorxusu, sosial bağın itməsi, işdən çıxarılma kimi halların yaşanması müxtəlif psixoloji narahatlıqlara təsir edəcəyi düşünülməkdədir. Belə ki yetkinlərdə COVID-19dan sonra təşviş pozuntusu, depressivlik, travma sonrası stres pozuntusu kimi narahatlıqları artıraraq özünə qəsd, yuxu rejiminin pozulması kimi nəticələri ortaya çıxarabiləcəyi düşünülməkdədir (Bekaroğlu, Yılmaz, 2020, Zandifar, Badrfam, 2020). Uşaq və yeniyetmələrdə isə COVID-19 əsasən qorxu və təşviş hallarını artırdığı qeyd olunmaqdadır. Eyni zamanda virusa yoluxanların və onlara xidmət edən personalın damğalanması, virus yayılmadan əvvəlki adətləri, rutinləri yerinə yetirərkən çətinliklərin ortaya çıxması, təcrid olunma qorxusu, irqçilik, ayrı seçicilik kimi sosial-psixoloji problemlərin yaşanmasına səbəb olacağı düşünülməkdədir (Dubey və dig., 2020). Buna görə də insanların pandemiyanın fərqli mərhələlərin necə təsirləndiklərini incələmək psixoloji tədqiqatların əsas hədəflərindən biri olmuşdur (Taylor, 2019).

Bu mövzuda aparılan tədqiqatlar göstərir ki,ölüm riski olan COVID-19 insanlarda depressiya və qayğı səviyyələrini artırmaqda, qalıcı psixoloji problemlərin yaranmasına yol açmaqda, təhlükənin qeyri müəyyən və mütəmadi olması isə xroniki qorxunun ortaya çıxmasına səbəb olmaqdadır (Fardin, 2020, Mertens, Gerritsen, Salemink ve Engelhard, 2020). Psixoloji dözümlülük səviyyəsi yüksək olan şəxslərin isə COVID-19 dövründə bu stresli periodu daha rahat keçirəbildikləri müşahidə olunmuşdur (Naeem, Irfan ve Javed, 2020).

Psixoloji ədəbiyyat incələndiyi zaman bu kimi pandemiyaların insanların psixoloji vəziyyətinə təsir etdiyi qeyd olunmaqdadır. Bu çalışmanın da məqsədi COVID-19 pandemiyası dövründə 17 yaşdan yuxarı şəxslərin psixoloji vəziyyətinin incələnməsidir. Xəstəliyin yayılması və ya COVID-19'la əlaqəli digər təşviş yaradıcı faktorların qarşısının alınması üçün atılan addımlar əhəmiyyətli olmaqla yanaşı insanların psixi sağlamlığı üçün xüsusi olaraq diqqət ayrılması vacibdir (Cullen, Gulati ve Kelly, 2020). Tibbi müdaxilərlə yanaşı insanlara qorxu, təşviş, depressiya və ya başqa hallar müşahidə olunduğu zaman psixoloji dəstəyin (psixokonsultasiya və ya psixoterapiya) verilməsinin əhəmiyyətli olduğu düşünülməkdədir (Xiang və digərləri, 2020). Buna görə tədqiqat nəticəsində əldə olunan məlumatların pandemiya dövründə göstəriləcək psixoloji dəstək üçün vacib mənbə olacağı düşünülməkdədir.

## 2. Metod

İştirakçı Qrupu

Tədqiqatın iştirakçı qrupunu onlayn formlarla iştirak etməyə razılıq bildirən 17-65 yaş aralığında olan, Azərbaycanın fərqli bölgələrindən 348 nəfər təşkil etmişdir. İştirakçıların seçimində yaxın, əldə olunması asan, maliyyəti az təşkil edən uygun nümunə seçmə metodundan istifadə olunmuşdur (Büyüköztürk, Çakmak, Akgün, Karadeniz və Demirel, 2018).

Data Toplama Vasitəsi və Dataların Toplanması

Tədqiqat dataları tədqiqatçılar tərəfindən hazırlanan *COVİD19 Anketi* və *Qısa Simptom İnvanterinin* tətbiq olunması nəticəsində əldə edilmişdir. Anketlər onlayn formada tətbiq olunmuşdur. Dataların toplanmasında könüllülük və gizlilik prinsipi nəzərə alınmış və buna görə də araşdırmada iştirak edənlərə adlarını yazmaqları istənilməmişdir. İştirak edənlərdən 348 nəfərin cavapladığı anketlər statistiki analiz olunmuşdur.

*Covid Anketi*

Tədqiqat üçün hazırlanmış anket iki hissədən ibarətdir. Birinci hissəsində şəxsi məlumatlar (cins, yaş, təhsil səviyyəsi, mədəni hal, ailə üzvlərinin sayı, ailənin gəlir səvviyəsi və yaşadığı bölgə) olan suallar yer almışdır. İkinci hissəsində isə iştirakçıların xüsusi karantin dövründə emosiya, düşüncə və davranışlarıyla ilə əlaqəli fikirlərini qiymətləndirən 11 açıq və qapalı sual yer almışdır.

*Qısa Simptom İnvanteri (QSİ)*

İştirakçıların psixoloji vəziyyətləri ölçmək üçün Kərimova və Osmanlı (2016) tərəfindən Azərbaycan dilinə adaptasiya edilmiş Qısa Simptomlar İnvanteri (Brief Symptom Inventory) tətbiq edilmişdir. QSİ psixoloji sıxıntı əlamətlərini ölçən 53 maddədən ibarət invanter olub, böyüklər arasında aparılan tədqiqatlarda çox istifadə olunmaqdadır (Derogatis, 1993). İnvanter 9 alt testdən ('Somatizasiya', 'Obsesif-Kompulsif', 'Şəxslərarası Həssaslıq', 'Depressiya', 'Narahatlıq', 'Düşmənçilik', 'Fobik Narahatlıq', 'Paranoid Fikirlər' və 'Psixotizm') və 3 qlobal indeksdən (Ümumi Şiddət indeksi (GSI), Müsbət Simptom Çətinliyi indeksi (PSDI) və Müsbət Simptom Cəmi (PST) ibarətdir. Maddələr son bir həftə ərzində meydana gələn fiziki və psixoloji simptomları ölçməkdədir (Derogatis və Melisaratos, 1983). Maddələr 5-li dərəcələndirmə şkalası (Heç, Çox az, Orta səviyyədə, Olduqca çox, Lap çox) ilə cavablandırılır.

Dataların Analizi

Tədqiqatda onlayn anket vasitəsi ilə əldə edilən datalar, kompüterə köçürülərək analiz edilmişdir. Anketdə yer alan sualların frekans və faiz dəyərləri hesablanmış, fərqli qrupların bal ortalamalarını qarşılaşdırmaq məqsədi ilə İndependent Samples T-Test, One Way ANOVA, MANOVA, dəyişənlər arasında münasibəti incələmək məqsədi ilə korrelyasiya testləri edilmişdir. Analizlər SPSS 24.0 Proqramı ilə həyata keçirilmişdir.

## 3.Nəticələr

Tətqiqat iştirak edənlərin 269-u (%77,3) qadın və 79-u (%22,7) kişidir. İştirakçıların yaş aralığına baxıldıqda tətqiqatda iştirak edənlərin yarısından çoxu (55,2 %) orta yetişkin fərdlərdən ibarət olduğu görülməkdədir. Bundan başqa, iştirakçıarın 17,2% orta məktəb, 53,2% bakalavr, 26,4% magistr və 3,2% də doktorantura dərəcəsində təhsil almışdırlar. Bundan başqa iştirakçıların böyük qismi Bakı-Abşeron bölgəsində yaşamaqda olub (73,6%), daha sonrakı sırada Şəki-Zaqatala bölgəsi (10,6%), Aran bölgəsi (5,2%), Gəncə-Qazax bölgəsi (4,3%), Quba-Xaçmaz bölgəsi (3,4%) və Naxçıvan Muxtar Respublikası (10,6%) gəlməkdədir.

**Cədvəl 1**

**İştirakçılarla bağlı sosio-demoqrafik məlumatlar**

| Cinsiyyət | N | % | Yaş | N | % | Təhsil səviyəsi | N | % | Bölge | N | % |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Qadın | 269 | 77,3 | 17-25 yaş | 111 | 31,9 | Orta | 60 | 17,2 | Baki-Abseron | 256 | 73,6 |
| Kişi | 79 | 22,7 | 26-40 yaş | 192 | 55,2 | Bakalavr | 185 | 53,2 | Quba-Xacmaz | 12 | 3,4 |
| | | | 41-65 yaş | 45 | 12,9 | Magistr | 92 | 26,4 | Seki-Zaqatal | 37 | 10,6 |
| | | | | | | Doktorant | 11 | 3,2 | Naxcivan | 6 | 1,7 |
| | | | | | | | | | Gence-Qazax | 15 | 4,3 |
| | | | | | | | | | Aran | 18 | 5,2 |

Tətqiqatdaiştirak edənlərim cədvəl 2`də də göründüyü kimi yarısı evli ikən (54,6%), yarısı subaydır (45,4 %). Bundan əlavə, karantin rejimində qaldıqları ailə tərkibini incələdiyimiz zaman 8,9% iki adamdan ibarət olan kiçik ailələrdə, 55,2% 4 nəfərdən ibarət olan ailələrdə, 35,9 % isə 5 nəfərdən çox olan böyük ailələrdə qaldıqları ortaya çıxmışdır. Yaşadıqlarının ailələrin aylıq gəlir səviyyəsininə görə iştirakçıların 28%i gəlir səviyəsini maksimum 500 azn, 47,1%igəlir səviyəsini 500 -1500 azn arasında, 19% 1500 -3000 arasında, 5,2% aylıq gəlirlərini 3000 azn`dən yuxarı səviyyədə ifadə etmişdirlər.

**Cədvəl 2**

**Ailə vəziyyəti ilə əlaqədar demografik məlumatlar**

| Mədəni Hal | N | % | Ailə Gəlir səviyyəsi | N | % | Ailədə nəfər sayısı | N | % |
|---|---|---|---|---|---|---|---|---|
| Evli | 190 | 54,6 | 0-500 AZN | 100 | 28 | Kiçik Ailə | 31 | 8,9 |
| Subay | 158 | 45,4 | 501-1500 AZN | 164 | 47,1 | Orta Ailə | 192 | 55,2 |
| | | | 1501-3000 AZN | 66 | 19 | Böyük Ailə | 125 | 35,9 |
| | | | 3001 ustu AZN | 18 | 5,2 | | | |

İştirakçılara pandemiya ilə əlaqəli məlumatları hansı mənbədən aldıqlarını müəyyənləşdirmək üçün "Koronavirus pandemiyası, xüsusi karantin rejimi ilə əlaqəli məlumatı hansı mənbədən alırsınız?" sualı yönəldilmiş, alınan cavablar analiz edilərək Cədvəl 3-də verilmişdir.

**Cədvəl 3**

**Pandemiya haqqında məlumat alma mənbəsi**

| | N | % |
|---|---|---|
| www.koronavirusinfo.az / Corona map / Qərargah | 62 | 17,8 |
| Sosyal Medya | 202 | 58,0 |
| xəbər saytarı | 175 | 50,3 |
| Tv radio | 161 | 46,3 |

Cədvəl 3`də də göründüyü kimi, iştirakçıların çoxu karantin və pandemiya ilə əlaqəli məlumatları daha çox sosial mediadan (58%) əldə edərkən, daha sonrakı sırada xəbər saytları (50,3%), Tv/ Radio (46,3%) gəlməkdədir. İştirakçıların sadəcə 17,8% virus, karantin və pandemiya ilə əlaqli məlumatları rəsmi mənbələrdən əldə etməkdədirlər.

Digər tərəfdən, xüsusivirus, karantin rejimi ilə əlaqəli məlumatı aldıqlarımənbələrin təhsil səviyyəsinə görə fərqlilik göstərib-göstərmədiyini test etmək üçün One Way ANOVA analizindən istifadə edilmişdir. Təhlillər nəticəsində əhəmiyyətli fərqlər ortaya çıxardığından qruplar arasındakı fərqi müəyyən etmək üçün varyansların homogenliyi yoxlanılmışdır. Varyansların homogenliyi halında, Scheffe və ya Bonferroni testləri çoxsaylı müqayisə testləri arasında üstünlük verilərkən, bərabərlik olmadığı təqdirdə, Games-Howell testindən istifadə edilmişdir. Qruplar arasındakı fərqi müəyyənləşdirmək üçün tətbiq edilən Games-Howell testi nəticəsində, rəsmi qaynaqlardan məlumat alma mövzusunda orta məktəb və magistr məzunları arasında mənalı bir fərqin olduğu

görülmüşdür (F(3, 344)= 2,72), *p*=,045). Belə ki, magistratura pilləsindən məzun olanların (M=,26, SD=.442) orta məktəb məzunlarına nəzərən (M=.10, SD=,303) daha çox rəsmi mənbələrdən istifadə etdikləri ortaya çıxmışdır. Bundan əlavə, TV və radiodan məlumat almaq mövzusunda isə doktorantura məzunları ilə digər məzunlar arasında mənalı bir fərqin olduğu görülmüşdür (F(3, 344)= 3,57), *p*=,014). Doktorantura məzunlarının (M=.91, SD=.301) digər iştirakçılara görə daha çox TV/Radiodan istifadə ettikləri ortaya çıxmışdır.

İştirakçılara xüsusi karantin zamanı evdə qalıb qalmadıqlarını müəyyənləşdirmək üçün "Xüsusi karantin dövründə heç evdən çıxmadığınız gün oldumu?" sualı yönəldilmiş, alınan cavablar analiz edilərək Cədvəl 4-də verilmişdir.

**Cədvəl 4**

**Pandemiya zamanı evdən çıxmama**

| | N | % |
|---|---|---|
| **Bəli** | **283** | **81,3** |
| **Xeyir** | **65** | **18,7** |

Cədvəl 4`də də göründüyü kimi, iştirakçıların çoxu (81,3 %) karantin zamanı heç evdən çıxmazikən, yalnız 18,7 % gün boyunca evdə qalmayaraq çölə çıxmışlardır.

İştirakçılara xüsusi karantin zamanı ən çox fərqində olduqları emosiyaları müəyyənləşdirmək üçün "Xüsusi karantin dövründə ən yüksək hissetdiyiniz hiss hansı(lar)dır?" sualı yönəldilmiş, alınan cavablar analiz edilərək Cədvəl 5-də verilmişdir.

**Cədvəl 5**

**Karantin dövründə ən çox hissedilən emosiyalar**

| | N | % |
|---|---|---|
| **Qorxu** | **34** | **9,8** |
| **Tədirginlik** | **119** | **34,2** |
| **Təşviş** | **46** | **13,2** |
| **Depresiya** | **59** | **17** |
| **Üzüntü** | **121** | **34,8** |
| **Normal** | **42** | **12,1** |

Cədvəl 5`də də göründüyü kimi, iştirakçıların çoxu xüsusi karantin zamanı üzüntü (34,8%) və tədirginlik (34,2%) hiss edərkən, daha sonrakı sırada depressiv (17%), təşviş (13,2%), qorxu (9,8%) gəlməkdədir. İştirakçıların 12,1% isə bu prosesi normal keçirdiklərini bildirmişdilər.

İştirakçılara karantin zamanı hansı qaydaya riayət etmək onlar üçün daha çətin olduğunu rmüəyyənləşdirmək üçün "Xüsusi karantin dövründə hansı qaydaya riayət etmək daha çətin oldu?" sualı yönəldilmiş, alınan cavablar analiz edilərək Cədvəl 6-də verilmişdir

**Cədvəl 6**

**Riayət etməkdə çətinlik çəkilən qaydalar**

| | N | % |
|---|---|---|
| **Əllərinizi tez-tez yumaq** | **19** | **5,5** |
| **Əl-ələ görüşməmək** | **28** | **8,0** |
| **Evdə qalmaq** | **152** | **43,7** |
| **Sosial təcrid** | **131** | **37,6** |
| **Maska istifadə etmək** | **100** | **28,7** |

Cədvəl 6`da da göründüyü kimi, iştirakçılar ən çox evdə qalmaqla əlaqəli mövzuda (43,7%) çətinlik çəkərkən, daha sonra sosial təcrid (37,6%), maska istifadə etmək (28,7%) gəlməkdədir. Əlləri tez tez yumaq (5,5%) və əl ələ görüşməmək (8%) kimi qaydalara riayət etmək mövzusunda iştirakçılarən çətinlik çəkmədikləri görülməkdədir.

Tədqiqatda eyni zamanda xüsusi karantin müddətinin davranışlara neqativ olaraq necə təsir etdiyini müəyyənləşdirmək üçün "Xüsusi karantin dövründə xoşlamadığınız hansı davranışlarınızın artdığını düşünürsünüz? " sualı yönəldilmiş, alınan cavablar analiz edilərək Cədvəl 7-də verilmişdir.

**Cədvəl 7**

**Karantin dövründə artan xoşlanılmayan davranışlar**

| | N | % |
|---|---|---|
| **Düzgün olmayan qidalanma** | **137** | **39,4** |
| **Rejimsiz yuxu** | **209** | **60,1** |
| **Evdə olanlarla daha çox mübahisə etmək** | **60** | **17,2** |
| **Uşaqlarla yüksək səslə danışmaq** | **33** | **9,5** |
| **Siqaret, spirtli içkiyə başlamaq (artırmaq)** | **7** | **2** |
| **Dəyişiklik olmadı** | **16** | **4,6** |
| **Onlayn saatlar çoxaldı** | **6** | **1,7** |

Cədvəl 7`də də göründüyü kimi, iştirakçıların çoxu yuxu rejimlərinin pozulduğunu bildirərkən (60,1%), daha sonra düzgün olmayan qidalanma (39,4%), evdə olanlarla daha çox mübahisə etmək (17,2%), uşaqlarla yüksək səslə danışmaq (9,5%), siqaret, spirtli içkiyə başlamaq kimi neqativ davranışlar sırayla gəlməkdədir. İştirakçıların 1,7% onlayn saatlarının çoxaldığını bildirərkən, 4,6% isə davranışlarında hər hansı bir dəyişikliyin olmadığını bildirmişdilər.

Artan neqativ davranışların yaşa görə fərqlilik göstərib-göstərmədiyini test etmək üçün One Way ANOVA analizindən istifadə edilmişdir. Təhlillər nəticəsində əhəmiyyətli fərqlər ortaya çıxarsa qruplar arasındakı fərqi müəyyən etmək üçün varyansların homogenliyi yoxlanılmışdır.Varyansların homogenliyi halında, Scheffe və ya Bonferroni testləri çoxsaylı müqayisə testləri arasında üstünlük verilərkən, bərabərlik olmadığı təqdirdə, Games-Howell testindən istifadə edilmişdir. Cədvəl 8`da görüldüyü kimi, artan negativ davranışların yaşa görə fərqlilik göstərib-göstərmədiyini test etmək üçün edilən One Way ANOVA analizi nəticəsində sadəcə "evdə olanlarla daha çox mübahisə etmək" mövzusunda gənc yetişkinlər ilə orta yetişkinlər arasında mənalı bir fərqin olduğu görülmüşdür ($F(2, 345)= 4,05$), $p$=,018). Qruplar arasındakı fərqi müəyyənləşdirmək üçün edilən Games-Howell testi nəticəsində, gənc yetişkinlərin (M=.25, SD=.436),orta yetişkinlərə nəzərən (M=.13, SD=.332) evdə daha çox mübahisə ettikləri ortaya çıxmışdır.

İştirakçıların psixoloji dəyərləndirilməsinə gəldikdə isə, Cədvəl 9`də görüldüyü kimi, diqqət çəkən ən önəmli məqam iştirakçılarda birçox psixoloji problemlər yüngül səviyyədə müşahidə edilmişdir.Belə ki, ən çox görülən psixoloji problem Obsesif-Kompulsif pozuntu olduğu görülməkdədir. Belə ki, Obsesif-Kompulsif pozuntuiştirakçıların 51,7%-də yüngül səviyyədə görülməkdə ikən, 30,8 % də isə yüksək vəya çox yüksək səviyyədə görülmüşdür. Bundan başqa, iştirakçıların 49,1 % də yüngül səviyyədə, 23,3 % də isə yüksək vəya çox yüksək səviyyədə depresiya görülmüşdür. Daha sonra 46,3%də yüngül səviyyədə Narahatlıq/Təşviş pozuntusu görülərkən, 25,6%də yüksək vəya çox yüksək səviyyədə görülmüşdür. Yenə, iştirakçıların 46 % də yüngül səviyyədə Düşmənçilik (Hostility) problemi müşahidə edilərkən, 18,4% də yüksək vəya çox yüksək səviyyədə görülmüşdür.

**Cədvəl 8**

**One Way ANOVA testi nəticələri**

| Evdə olanlarla daha çox mübahisə etmək | N | M | SD |
|---|---|---|---|
| Gənc yetişkin | 111 | ,25 | ,436 |
| Orta yetişkin | 192 | ,13 | ,332 |
| İrəli yetişkin | 45 | ,18 | ,387 |
| Total | 348 | ,17 | ,378 |

| | SS | df | MS | F | P | Difference (Games-Howell) |
|---|---|---|---|---|---|---|
| Between Groups | 1,140 | 2 | ,570 | 4,055 | ,018* | 1-2 |
| Within Groups | 48,515 | 345 | ,141 | | | |
| Total | 49,655 | 347 | | | | |

*p<.05

QSİ nəticələrinin cinsə görə fərqlənib fərqlənmədiyini incələmək üçün müstəqil nümunələr üçün T-testdən istifadə edilmişdir.İlk öncə, varyansların bərabərliyi üçün Levene'nin test incələnmişdir (p > .05). Cədvəl 10`da görüldüyü kimi, T-testində nəticələr incələndiyi zaman, p < .05 səviyyəsində Somatizasiya (t (346)=1.76, *p* <.05), Şəxslərarası Həssaslıq (t (346)=2.12, *p* <.05), Depressiya (t(346)=2.10, *p* <.05), Narahatlıq/Təşviş (t (346)=2.15, *p* <.05), Düşmənçilik (t (346)=1.94, *p* <.05), Psixotizm (t (346)=1.73, *p* <.05) alt maddələrində qadınların lehinə mənalı fərqin olduğu müşahidə edilməkdədir. Digər yandan, Obsesif-Kompulsif, Fobik Narahatlıq, Paranoid Fikirlər ve Digər alt maddələrə baxıldığı zaman cinsiyyətə görə bir fərqlilik görülməmişdir (p > .05).

**Cədvəl 9**

**QSİ nəticələri**

| | **Normal** | | **Az** | | **Yüksək səviyyədə** | | **Çox yüksək səviyyədə** | |
|---|---|---|---|---|---|---|---|---|
| | **N** | **%** | **N** | **%** | **N** | **%** | **N** | **%** |
| **Somatizasiya** | **156** | **44,8** | **154** | **44,3** | **26** | **7,5** | **12** | **3,4** |
| **Obsesif-Kompulsif** | **61** | **17,5** | **180** | **51,7** | **83** | **23,9** | **24** | **6,9** |
| **Şəxslərarası Həssaslıq** | **115** | **33,0** | **130** | **37,4** | **74** | **21,3** | **29** | **8,3** |
| **Depressiya** | **96** | **27,6** | **171** | **49,1** | **59** | **17,0** | **22** | **6,3** |
| **Narahatlıq/Təşviş** | **98** | **28,2** | **161** | **46,3** | **67** | **19,3** | **22** | **6,3** |
| **Düşmənçilik** | **124** | **35,6** | **160** | **46,0** | **47** | **13,5** | **17** | **4,9** |
| **Fobik Narahatlıq** | **125** | **35,9** | **149** | **42,8** | **55** | **15,8** | **19** | **5,5** |
| **Paranoid Fikirlər** | **99** | **28,4** | **152** | **43,7** | **76** | **21,8** | **21** | **6,0** |
| **Psixotizm** | **156** | **44,8** | **149** | **42,8** | **37** | **10,6** | **6** | **1,7** |
| **Digər** | **90** | **25,9** | **178** | **51,1** | **61** | **17,5** | **19** | **5,5** |

* 346df, p <0.05

QSİ nəticələrinin gəlir səviyyəsinə görə fərqlənib fərqlənmədiyini incələmək üçün edilən MANOVA testinin nəticələri QSİ nəticələrinin hər üç gəlir səviyyəsinə görə mənalı fərqlilik göstərmədiyi görülmüşdür (p>.05). Yenə, QSİ nəticələrinin ailədəki nəfər sayısına görə fərqlənib fərqlənmədiyini incələmək üçün edilən MANOVA testinin nəticələri QSİ nəticələrinin hər üç ailə strukturan görə mənalı fərqlilik göstərmədiyi görülmüşdür (p>.05).

**Cədvəl 10**

**Cinsi və QSİ görə T- testi nəticələri**

| QSİ | Cinsiyyət | N | Mean | Sd | t | p |
|---|---|---|---|---|---|---|
| Somatizasiya | Qadın | 269 | 1,76 | ,785 | 2,902 | ,004 |
| | Kişi | 79 | 1,48 | ,596 | 3,365 | |
| Obsesif-Kompulsif | Qadın | 269 | 2,23 | ,838 | 1,412 | ,117 |
| | Kişi | 79 | 2,08 | ,683 | 1,578 | |
| Şəxslərarası Həssaslıq | Qadın | 269 | 2,12 | ,964 | 2,740 | ,006 |
| | Kişi | 79 | 1,80 | ,791 | 3,050 | |
| Depressiya | Qadın | 269 | 2,10 | ,877 | 3,351 | ,000 |
| | Kişi | 79 | 1,75 | ,609 | 4,067 | |
| Narahatlıq/Təşviş | Qadın | 269 | 2,15 | ,852 | 4,787 | ,000 |
| | Kişi | 79 | 1,65 | ,734 | 5,192 | |
| Düşmənçilik | Qadın | 269 | 1,94 | ,841 | 2,552 | ,011 |
| | Kişi | 79 | 1,67 | ,711 | 2,797 | |
| Fobik Narahatlıq | Qadın | 269 | 1,90 | ,857 | -,489 | ,625 |
| | Kişi | 79 | 1,95 | ,846 | -,492 | |
| Paranoid Fikirlər | Qadın | 269 | 2,08 | ,887 | 1,235 | ,218 |
| | Kişi | 79 | 1,95 | ,766 | 1,338 | |
| Psixotizm | Qadın | 269 | 1,73 | ,766 | 1,711 | ,047 |
| | Kişi | 79 | 1,57 | ,570 | 2,004 | |
| Digər | Qadın | 269 | 2,05 | ,856 | ,956 | ,257 |
| | Kişi | 79 | 1,95 | ,618 | 1,138 | |

Müstəqil nümunə t testi, * $p < .05$

Bu tədqiqatda yaşı 17-dən yuxarı olan şəxslərin pandemiya dövründə psixoloji vəziyyətlərinin incələnməsi aparılmışdır. Bu məqsədlə inventar və form vasitəsilə onlayn şəkildə əldə olunan datalar statistiki analiz olunmuşdur. İştirakçılara açıq sual şəklində verilən "Koronavirus pandemiyası, xüsusi karantın rejimi ilə əlaqəli məlumatı hansı mənbədən alırsınız?" sualına əksər iştirakçılar sosial media olduğu bildirmişdilər. Bildiyimiz kimi sosial media vasitəsilər insanlar həm çoxsaylı həm də əsassız xəbər və ya məlumatlara məruz qala bilirlər. Səhv məlumat təkzib olunsa belə insanların inanclarına və yanaşma tərzlərinə təsir etdiyi bilinməkdədir (Duraisamy, Rathinaswamy, 2020). Ona görə sosial mediadan alınan məlumatların pandemiya dövründə təşviş halının artmasına təsir edən faktor ola biləcəyi düşünülməkdədir. Korona virüs haqqında məlumat almanın iştirakçların təhsil səviyyəsinə görə fərqliliyi incələndiyi zaman magistratura səviyyəsində təhsil alanların orta məktəb məzunlarına görə daha çox rəsmi mənbələrə başvurduqları ortaya çıxmışdır. Doktorantura təhsili olanlar isə koronavirus haqqında rəsmi xəbər qaynağı hesab edilən tv, radio kimi mənbələrdən xəbər alırlar. Tədqiqatın nəticəsinə görə təhsil

səviyyəsi artdıqca rəsmi mənbələrdən məlumat alanların sayının artdığı ortaya çıxmışdır. Sosial mediadan məlumat alanların zehni yorğunluğunun çox olduğu, təşviş narahatlıq hiss yaratdığı və psixoloji dözümlülüyünün rəsmi mənbədən məlumat alanlarda daha yüksək olduğu tapılmışdır (Tonbü, 2020).

Tədqiqat nəticəsində iştirakçıların ən çox yaşadığı hisslərin sırasıyla təşviş, üzüntü, depressiya olduğu tapılmışdır. İnsanların özlərinin və yaxınlarının COVID-19a yoluxma qorxusu, yaxınlarını itirmə qorxu və üzüntüsü, iş və maddi itkilərə görə üzüntünün artması, karantin və virusla əlaqəli yaşanılan qeyri müəyyənliyin depressiya hissini artırdığı düşünülməkdədir (Pfefferbaum ve North, 2020).

Tədqiqatda iştirak edənlərə karantin dövründə hansı xoşagəlməz davranışların artdığı sorulmuş, cavab olaraq yuxu rejimiin pozulması ilk sırada yer almışdır ki, bununda təşviş və depressiya hissinin artmasına təsir edəcəyi düşünülməkdədir. Brooks və digərlərinə (2020) görə karantin rejiminin uzun olması, infeksiya qorxusu, ümidsizlik, kifayət qədər dəqiq məlumat ala bilməmək, maddi itkilər və damğalanma karantin dövrünün stres faktorları olaraq bilinməkdədir.

Tədqiqatda karantin tətbiq olunandan sonra hansı davranışlarda artış olduğu müəyyən edilmişdir. Belə ki, aparılan analiz nəticəsində qidalanma rejiminin pozulması, ailə üzvləri ilə münasibətdə gərginliklərin yaşanması, alkoqollu içkilərdə və tütün məmulatlarından istifadənin artması, onlayn saatlarda artışın olduğu tapılmışdır. Bu nəticələrə görə karantin dövrünün insanların şəxsi və ictimai həyatından fizioloji, psixoloji, sosial təsirinin olduğu düşünülməkdədir. COVID-19 karantin dövrü ilə travma sonrası stres pozuntusunun, təşviş və yuxu problemləri arasında əlaqənin olduğuna dair nəticələr digər tədqiqatlarda yer almaqdadır (Rossi,Socci,Talevi, Mensi, 2020).

İştirakçıların psixoloji dəyərləndirilmələri məqsədilə tətbiq oluna qısa simptom invanterinin nəticəsinə görə iştirakçılarda ən çox görülən pozuntu obsessiv kompulsiv pozuntudur. İştirakçıların 30 faizində bu pozundur yüksək və daha yüksək səviyyədə görülmüşdür. Eyni zamanda 23 faizində depressiya, 25 faizində təşviş pozuntusu, 18 faizində isə düşmanlıq, əsəb problemi yüksək və daha yüksək səviyyədə görülmüşdür. Wang, 2020 və Duan Zhu, 2020 tədqiqatlarıında da insanların pandemiya dövründə depressiya, təşviş, stres, isteriya və baş və əzələ ağrısı kimi fiziki simptonların yaşanıldığı tapılmışdır. Aparılan tədqiqatda qadınlarda somatizasiya, səxslər arası həssaslıq, depressiya, təşviş, əsəb, psixotizm daha çox görünərkən, obsessiv-kompulsiv, fobik narahtlıq, paranoid fikirlər və digər alt maddələr baxlmından cinsiyyət arası fərq görülməmişdir.

Azərbaycanda pandemiya zamanı aparılan psixoloji tədqiqatların kifayət qədər olmadığı görülməkdədir. Buna görə də bu mövzuda aparılacaq tədqiqatlara ehtiyac duyulur. Tədqiqatdan əldə olunan nəticələr pandemiya və ya karantin dövründə əhalinin psixi sağlamlığı ilə əlaqəli çalışmaların artmasının vacibliyini göstərdi. Eyni zamanda bu kimi çalışmalarla əldə olunan nəticələr insanlara göstəriləcək psixoloji yardımda yolgöstərici olacağı düşünülməkdədir.

Nəticə olaraq COVID-19 insanların psixoloji sağlamlığına mənfi təsir edən bir faktordur. Xüsusilə şəxsin öz dünyasında ailə münasibətlərində bu təsir diqqət çəkməkdədir. Yoluxmanın artma temposu psixoloji narahatlıqların da dərinləşməsi təsir edəbilər. Buna görə də virusla aparılan mübarizədə psixoloji yardımın gücləndirilməsi üçün psixiatr, psixoloq, psixoloji konsultantlardan ibarət komandaların istər virusa yoluxan xəstələrə istərsə də səhiyyə işçilərinə dəstək verməsi, medya vasitəsilə psixoloji məlumatlandırılmaların aparılması vacib görülməkdədir.

## References

1. https://koronavirusinfo.az/az
2. Dubey, Biswas, Ghost və digərləri,. (2020)Psychosocial impact of COVID-19, Diabetes and Metabolic Syndrome Clinical Research and Reviews 14(5):779-78, DOI: 10.1016/j.dsx.2020.05.03
3. Depoux A, Martin S, Karafillakis E, Bsd RP, Wilder-Smith A, Larson H. (2020) The pandemic of social media panic travels faster than the COVID-19 outbreak. *Journal of Travel Medicine*, 27/3, doi.org/10.1093/jtm/taaa031
4. Kluge HNP. (2020). Statement e physical and mental health key to resilience during COVID-19 pandemic. http://www.euro.who.int/en/health-topics/ health-emergencies/coronavirus-covid-19/statements/statement-physicaland-mental-health-key-to-resilience-during-covid-19-pandemic (accessed on 30th March, 2020).
5. Zandifar, A, Badrfam R. (2020) Iranian mental health during the COVID-19 epidemic, Asian Journal of Psychiatry,51, doi.org/10.1016/j.ajp.2020.101990
6. Xiang,Y., Yang, Y., Li, W., Zhang, L., Zhang, Q., Cheung, T., (2020). Timely mental health care for the 2019 novel coronavirus outbreak is urgently needed, Lancet Psychiatry
7. Brooks, S.K., Webster, R.K., Smith, L.E., Woodland, L., Wessely, S., Greenberg, N., Rubin, G.J., 2020, The psychological impact of quarantine and how to reduce it: rapid review of the evidence, *The Lancet*,395/10227,doi.org/10.1016/S0140-6736(20)30460
8. Fardin, M.A. (2020). Covıd-19 andanxiety: A review of psychological impacts of infectious disease outbreaks. *Arch Clin Infect Dis, In Press* doi: 10.5812/archcid.102779.
9. Mertens, G., Gerritsen, L., Salemink, E. ve, Engelhard, I.M. (2020). Fear of the coronavirus (COVID-19): Predictors in an online study conducted in March 2020. PsyArXiv, doi.org/10.31234/osf.io/2p57j.
10. Naeem, F.,Irfan, M. ve Javed, A. (2020). Copingwith COVID-19: urgent need for building resilience through cognitive behaviour therapy. *Khyber MedUniv Journal*; 12(1):1-3. DOI: 10.35845/ kmuj.2020.20194.
11. Tönbül, Ö., (2020). Koronavirüs (Covid-19) Salgını Sonrası 20-60 Yaş Arası Bireylerin Psikolojik Dayanıklılıklarının Bazı Değişkenler Açısından İncelenmesi, *Uluslararası Akademik Psikolojik Danışma ve Rehberlik Araştırmaları Dergisi*,*2/2*:159-174
12. Büyüköztürk, Ş., Kılıç-Çakmak, E., Akgün, Ö.E., Karadeniz, Ş. ve Demirel, F. (2018). Eğitimde bilimsel araştırma yöntemleri. Ankara, Pegem Akademi Yayıncılık.
13. Kerimova, M., Osmanlı, N., (2016) The Brief Symptom Inventory: A validity-reliability Study of a Sample from Azerbaijan, Journal of Education and Training Studies, 4/12: doi.org/10.11114/jets.v4i12.2000
14. Derogatis, L. R., & Spencer, P. M. (1993). Brief symptom inventory: BSI. Upper Saddle River, NJ, USA::Pearson.
15. Derogatis, L. R., & Melisaratos, N. (1983). The Brief Symptom Inventory: An Introductory report. Psychological medicine, 13(03), 595-605. https://doi.org/10.1017/S0033291700048017
16. Duraisamy, B., Rathinaswamy, J., (2020). Social Media Reigned by Information or Misinformation About COVID-19: A Phenomenological Study, SSRN Electronic Journal 09/03:585-602, 10.2139/ssrn.3596058

17. Rossi, R., Socci, V., Talevi, D., Mensi, S., (2020). COVID-19 pandemic and lockdown measures impact on mental health among the general population in Italy. An N=18147 web-based survey, doi: 10.1101/2020.04.09.20057802
18. Tathan Bekaroğlu, Ece & Yilmaz, Tugba. (2020). COVID-19 ve Psikolojik Etkileri: Klinik Psikoloji Perspektifinden Bir Derleme. Nesne Psikoloji Dergisi. 8. 573-584. 10.7816/nesne-08-18-14.
19. Taylor, S. (2019). The psychology of pandemics: preparing for the next global outbreak of infectious disease. Newcastle upon Tyne: Cambridge Scholars Publishing.
20. Pfefferbaum, B. ve North, C. S. (2020). Mental health and the Covid-19 pandemic. New England Journal of Medicine. doi:10.1056/NEJMp2008017
21. Wang, Y., McKee, M., Torbica, A. ve Stuckler, D. (2019). Systematic literature review on the spread of health-related misinformation on social media. Social Science & Medicine, 112552.
22. Wang, C., Pan, R., Wan, X., Tan, Y., Xu, L., McIntyre, R. S., ... Ho, C. (2020). A longitudinal study on the mental health of general population during the COVID-19 epidemic in China. Brain, Behavior, and Immunity. doi:10.1016/j.bbi.2020.04.028
23. Duan, L. ve Zhu, G. (2020). Psychological interventions for people affected by the COVID-19 epidemic. The Lancet Psychiatry, 7(4), 300-302. doi:10.1016/S2215-0366(20)30073-0

**Rəyçi: dos.R.Cabbarov**

Göndərilib: 16.07.2021 Qəbul edilib: 23.07.2021

ELMİ İŞ beynəlxalq elmi jurnal. 1.518 Yüksək İmpakt Faktorlu. 2021 / Cild: 15 Sayı: 7 ISSN: 2663-4619
SCIENTIFIC WORK international scientific journal. 1.518 With High Impact Factor. 2021 / Volume: 15 Issue: 7 e-ISSN: 2708-986X

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/73-77

**Xalidə Qələndər qızı İsmayılova**
Bakı, Azərbaycan
h-melikzade@mail.ru

# NİZAMİ ƏDƏBİ İRSİ BƏŞƏR HƏQİQƏTLƏRİNƏ KÖRPÜDÜR

***Açar sözlər:*** *Nizami, Gəncə, Gəncəvi, söz, şeir, poema, şair, bəşər, dünya, mütəfəkkir, ideya, ideal, dövr, zaman, şəxsiyyət*

## Nizami's literary heritage is bridge for the reality of mankind

**Summary**

Nizami's heritage is wide meaningful, the author shows the poet's literary works with short considerations, he wants to explain to the readers that Nizami's literary works were founded on the literary grounds. Example, when the value system of life breaks down, a man can't understand his essence, he is indifferent against the nature and Allah (the God), this is important idea that no idea is higher than the idea of Allah. Each high idea makes the necessity against Allah and etc. The ideological line in the novel manifests in a large scale inspite of its short ground.

***Key words:*** *Nizami, Ganja, Ganjavi, word, poem, poet, mankind, world, thinker, idea, ideal, period, time, personality*

Bilirik ki, dünya şeir xəzinəsinin incisi Nizami Gəncəvi (1141-1209) Azərbaycanın qədim şəhərlərindən olan Gəncədə yaşamış, orada gözəl ədəbi irs yaratmışdır. Sivilizasiyalı cəmiyyətlərin həyat tərzini, hətta məişət və məşğuliyyətini öz sanballı əsərlərində aktual məsələ kimi cilalayan dahi şair dünya söz sənətinin lokomotivi hesab olunur. Onun geniş şöhrət tapmış "Xəmsə"si (beş mühüm ədəbi komponentli əsərlər toplusu) dünya poetik-fəlsəfi fikrinin zirvəsində dayanır. Dünya söz səltənəti səmimi etiraf edir ki, o, bütün cəmiyyətlər üçün bərqərar (böyük) bir ədəbi məktəbin bünövrəsini qoyub. Heç şübhəsiz, ondan sonra sözə könül verənlərin hamısının poetik ruhunda Nizami ədəbi dərki aşkar hiss olunur.

Dünyada olduğu kimi, ölkəmizdə də Nizami Gəncəvi yaradıcılığı geniş öyrənilib. Bu gün də dahi şairin ədəbi iris yeni əlifba ilə kütlələrə təqdim olunur, Nizami şeiriyyəti öz təbliğat maşınını daha da sürətləndirir. İnformasiya mənbələrindən bildiyimiz kimi, Nizaminin ədəbiyyatda və incəsənətdə yaddaqalan, həm də unikal sənət səciyyəsi olan işıqlı obrazı yaradılıb. Yəni mütəfəkkir şairin Gəncədə məqbərəsi, Bakıda, Sankt-Peterburqda və Romada heykəlləri ucaldılıb. Azərbaycan Milli Elmlər Akademiyasının Ədəbiyyat İnstitutu və Milli Azərbaycan Ədəbiyyatı Muzeyi Nizami Gəncəvinin adını daşıyır. Böyük Britaniyanın Oksford Universitetinin Nizami Gəncəvi Mərkəzi uğurla fəaliyyət göstərir. Bütün bunlar dahi şairin dünya söz xəzinəsinə verdiyi töhfənin bariz təcəssümüdür.

Dahi şairin yaradıcılığında bəşəri həqiqətlər daha dolğun şəkildə ehtiva edir. Əbəs yerə deyil ki, bu gün bütün dünyada Nizami Gəncəvi yaradıcılığına böyük bir təşnəlik var. Məhz Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 2021-ci ilin "Nizami Gəncəvi İli" elan edilməsi haqqında Sərəncamı da elə bu reallığı özündə əks etdirir.

Bəllidir ki, 2021-ci ildə dahi şair və mütəfəkkir, dünya şöhrətli söz azmanı Nizami Gəncəvinin anadan olmasının 880 illiyi tamam olur. Əlbəttə, ölkə prezidentinin sərəncamına uyğun olaraq Nizami ədəbi irsi daha böyük planda əxz olunacaq, onun əsərlərinin mahiyyəti bir daha öz sanbalını nümayiş etdirəcək. Bu da təbii ki, keçiriləcək tədbirlərdə özünü büruzə verəcək.

Heç kim inkar etmir ki, Nizami Gəncəvi şeiriyyəti insanları daim əxlaqi saflığa çağırıb, onlarda yüksək mənəvi keyfiyyətlər aşılayıb, bu gün də həmin missiya eyni ruhda davam edir. Onun zəngin yaradıcılığını bəşərin ümdə nailiyyəti hesab edənlər yanılmırlar. Çünki Nizami sözün həqiqi mənasında bəşəriyyətin bədii fikir salnaməsində yeni səhifə açmış nadir şəxsiyyətlərdəndir. Onun parlaq ədəbi irsi əsrlərdən bəri Şərqin misilsiz mədəni sərvətlər xəzinəsi kimi diqqət çəkib, bu gün də bəşəri yeni, fərqli ampulada düşündürür.

Səmimi etiraf edək ki, Azərbaycanın klassik ədəbi-mədəni irsinə, bədii söz yaradıcılığlna həmişə milli təəssübkeşlik və vətənpərvərlik mövqeyindən yanaşmış ümummilli lider Heydər Əliyev də Nizami irsinə xüsusi diqqət yetirmişdir. Məhz onun təşəbbüsü ilə 1979-cu ildə qəbul olunmuş "Azərbaycanın böyük şairi və mütəfəkkiri Nizami Gəncəvinin irsinin öyrənilməsini, nəşrini və təbliğini daha da yaxşılaşdırmaq tədbirləri haqqında" qərar Nizami yaradıcılığının tədqiqi və təbliği üçün yeni perspektivlər açmışdır. Ölməz sənətkarın 1981-ci ildə Ulu Öndərin bilavasitə təşəbbüsü və iştirakı ilə keçirilmiş 840 illik yubiley mərasimləri ölkənin mədəni həyatının əlamətdar hadisəsinə çevrilmişdir. 2011-ci ildə də Nizami Gəncəvinin 870 illiyi dövlət səviyyəsində silsilə tədbirlərlə geniş qeyd edilmiş, bəşər tarixində bir daha böyük Nizami Obrazı möhtəşəmlik qazanmışdır.

Nizami Gəncəvini dövrünün əsl söz xiridarı olduğunu onun qədim dillərdən pəhləvi, nəsturi, yəhudi dillərini bilməsi və bu dillərdə mümkün zərurətlər ortaya qoyması da təsdiq edir. Bu, o zamanlar da, indi də onun yaradıcılığının daha çoxhaxəli və daha genişperspektivli olmasını şərtləndirir. Çünki dahi şairin mövzularının çoxu məhz elə o qədim dillərdəki məxəzlərdən qaynaqlanmış, bu qədər təsirli alınmışdır.

Nizami Gəncəvi könüldən Allaha etiqad edən filosof şairlərimizdəndir. Məsələn, o, sonuncu "İskəndərnamə" əsərində öz vəziyyətini təsvir edərkən bildirir ki, onun "Allaha sığınmaqdan başqa qayğısı yoxdur". Özünü məşhur yunan filosofu Sokratla müqayisə edən dahi şair zamanında ona göstərilən ehtiram və etibarın səbəbini yenə Sokratın cümləsi ilə şərh edir: "İnsanlar onlardan qaçanlara daha çox meyl edərlər." Əslində, bu fəlsəfi məntiqin obyektində insanın faili-muxtar, həyatın isə sərvət hərisliyindən ibarət olduğu anlaşılır. Nizami o dövrün həqiqətlərini bu tərzdə cəmiyyətlərin ədəbi dərkinə sığışdırır və müasirləşdikcə, bundan nəticə çıxarmağı məsləhət bilir.

Nizami Gəncəvi özünün ölməz beş poeması ("Sirlər xəzinəsi", "Xosrov və Şirin", "Leyli və Məcnun", "Yeddi gözəl", "İskəndərnamə") ilə dünya ədəbiyyatına tamamilə yeni bir poetik səs, nəfəs gətirmişdir. Onun təkcə "Leyli və Məcnun" əsərinə Şərqdə və Qərbdə müxtəlif dillərdə 500-ə qədər şair nəzirə yazmışdır. Bu və bir çox ədəbi xüsusiyyətlərinə görə Nizami XII-XVI əsrlər Azərbaycan ədəbiyyatının ən yüksək zirvəsi sayılır. Necə ki, əsrlər əvvəl bəşərin söz sərrafları dahiş şairin poetik irsinə bir təşnəlik hiss edib, bu gün də dünya ədəbi irsi Nizami Gəncəvi yaradıcılığının ehtişamından qaynaq götürür və bunu aşkar ifadə edir.

Böyük şair qələmə aldığı irihəcmli poemaları ömrünün son anlarında "Xəmsə" ("Beşlik") adı altında birləşdirmiş, sanki bununla öz ədəbi irsinin sanbalını müəyyən etmişdir.

"Xəmsə"sədən də göründüyü kimi, Nizami yaradıcılığını lirik şeirlər - qəsidə, qəzəl və rübailər təşkil edir. Onun dövrümüzə gəlib çatmış "Divan"ında da bu ədəbi xətt özünü aydın göstərir.

Xaqani irsindən ilham almış Nizami yaradıcılığındakı estetik ideal Azərbaycan ədəbiyyatının mayası kimi təcəssüm edir. Bu, sonrakı ədəbi inkişafa güclü təkan vermiş, təkcə Azərbaycan deyil, bütövlükdə Yaxın və Orta şərq, eləcə də bir sıra Qərb ədəbiyyatlarında humanist meyllərin intişarına səbəb olmuşdur. Mədəni mühitin formalaşmasında, bədii prosedurların bu müstəvidə unikal səciyyə daşımasında Nizami yaradıcılığı mühüm rol oynayır.

İnsan və cəmiyyətin inkişafındakı müasir səviyyə, insanın yaratdığı və nəsildən-nəsilə ötürdüyü maddi və mənəvi dəyərlər onun söz səltənətində geniş ehtiva edir.

Cəmiyyətin fəaliyyət dairəsinin genişlənməsi, hətta maarifçilik, savad, tərbiyə və s.-in də ictimai səciyyə daşımasında Nizami yaradıcılığının təsirləri böyükdür. Biz məhz bu aparıcı proseslərdən qaynaqlanıb dahi şairin özünü və bəşər tarixində əhəmiyyəti rol oynayan yaradıcılığını Tanrı tərəfindən bizə bəxş edilmiş sərvət, insanlar tərəfindən dərk edilmiş maddi və mədəni dəyərlər, bizi əhatə edən təbiəti qiymətləndirmək üçün bizə verilmiş şans hesab edirik.

Həmçinin, biz Nizami yaradıcılığındakı əhatəli həyat dəyərlərini, davranış qaydalarını, maddi-mənəvi resursları insanın yaşadığı mühit və mədəniyyətin formalaşmasında böyük rol oynayan əsas, aparıcı amil kimi də xarakterizə edirik.

Bəlli ki, dünyanın ən qədim xalqlarından olan Azərbaycan xalqı özünün tarixi, maddi-mədəniyyət abidələri, zəngin ədəbiyyatı, incəsənəti və musiqi mədəniyyəti, bütövlükdə, ədəbiyyatı, söz xəzinəsi ilə haqlı olaraq fəxr edir. Əgər Azərbaycan xalqının bədii təfəkkür və yaradıcılığına ölkənin gözəl təbiəti, iqlimi, təbii sərvətlərinin zənginliyi böyük təsir göstərirsə, bu prosesə ölməz söz xiridarlarının yaratdığı misilsiz ədəbiyyat xəzinələri də mümkün təsirlər göstərir. Bu mənada, ölkəmizin müxtəlif sənət növlərinin hər biri ayrı ayrılıqda uzun və mürəkkəb inkişaf yolu keçib, birlikdə vəhdət təşkil edərək Azərbaycan ədəbi atmosferi barədə tam təsəvvür yaratmağa geniş imkan verir.

Bəllidir ki, sivilizasiya inkişaf etdikcə, təkcə dünyada gedən proseslər deyil, həmçinin mədəni zərurətlər də texnika və şəkilcə dəyişilməyə məruz qalmışdır. Belə olan halda ədəbiyyat da səciyyəvi xüsusiyyətlərini dövrə uyğun təcəssüm etdirmişdir. Nizami ədəbi irsində pərvəriş tapan incəliklər, bəşəri özünüdərk bu zəruri prosesin bir təzahürü kimi xarakterizə olunmalıdır.

Nizami yaradıcılığının bəşəri təsəvvüfünü onun beynəlxalq mədəni proseslərdəki fəallığı ilə isbat etmək mümkündür. Dahi şairin «Xəmsə»sində zahir olan əsas ictimai və fəlsəfi arqument bu rakursdadır. Məhz bu məntiqi əsas götürərək deyə bilərik ki, Nizami yaradıcılığının ölkələrarası tolerantlıq, multukultural dəyərləri də öz sərbəst xarakterini aydın ifadə edir. Ölməz şairin hansı əsərinə, hətta ən kiçik rübaisinə belə diqqət yetirsək, orada bu dəyərlərin ictimai zəmin kəsb etdiyinə şahidlik etmiş olarıq.

Bəlli ki, yeniləşən, inkişaf edən ölkələrdə insan modeli, insan hüquq və azadlıqları prinsipləri, vətəndaş amili əsas diqqət və qayğı hədəfi kimi xarakterizə olunub. Bu proses ədəbiyyatda da özünü kommunikativ əsaslar kimi səciyyələndirib. Nizami Gəncəvinin özündə ciddi sosioloji məqsədlər ehtiva edən, nəticə etibarilə, humanistlik, modernləşmə cəhdləri ilə xarakterizə olunan əsərlərində vətəndaş cəmiyyəti aparıcı xətti kimi diqqət çəkir. Bu, onun ədəbi irsinin fövqəltəbii olması və dünya söz inciləri tarixinə böyük töhfələr verməsini şərtləndirir. Bu barədə dünyanın yetkin söz adamları nüfuzlu fikirlər səsləndirmişlər

Əgər diqqətlə araşdırılsa, məlum olar ki, Nizami söz yaradıcılığı gerçək mənada bəşər tarixinə bir körpüdür. Hələ əsrlər əvvəl dahi şair ölkələrin davamlı inkişaf mərhələsinin başlaması üçün öz əsərlərində sətiraltı müəyyən zərurətlər açmış, cəmiyyətlərin sosial-iqtisadi həyatında baş verən müsbət dəyişiklikləri insan kapitalının inkişaf mərhələsi kimi göstərmişdir. Eləcə də dini tolerantlıq və multukulturalizm işində qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşmaq, vətəndaşların həyata baxışını yüksəltmək üçün sivil innovasiyalardan düzgün istifadə etmək Nizami fikrinin vacib prioritetidir. Bu gün sivill ölkələr Nizami fikrindən yetərincə faydalanır və əbəs yerə onu fövqəltəbii şair adlandırmırlar.

Açığı, Nizami Gəncəvinin zəngin yaradıcılıq çeşməsində ən mühüm yerlərdən birini onun həyat və məişət, gündəlik güzəranla bağlı olan xalq sənətləri tutur. Ən qədim dövrlərdən zəmanəmizədək davam edən bu sənət növü xalqın geyimindən tutmuş müxtəlif təsərrüfat

məmulatı və bəzəyinə qədər böyük bir sahəni əhatə edir. Bu istiqamətdə dahi şairin «Sirlər xəzinəsi», «Yeddi gözəl» və «İsgəndərnamə» əsərləri ümdə vəzifə daşıyır.

Təbiidir ki, xalqımızın məişət xüsusiyyətləri, estetik zövgü, bir sözlə milli siması, mənliyi Nizami ədəbi irsinin apardığı işin bir hissəsidir və bundan sonra da özünü xüsusilə parlaq şəkildə büruzə verəcək.

Min illərdir zəngin mədəni irsə malik olan Azərbaycan ədəbiyyatı sehrkar təsirləri ilə diqqət çəkir. Xaqani məktəbindən qaynaqlanan Nizami Gəncəvi poetik irsi də bu yöndə lazımlı xarakterləri ilə əhəmiyyət kəsb edir. Elə buna görə dünya söz mədəniyyəti xəzinəsini öz nadir inciləri ilə zənginləşdirən Azərbaycan ədəbiyyatının çoxəsrlik ənənələri var. Bu ənənələri nəsildən-nəsilə ötürərək böyük və zəngin bir irs yaradan Nizami Gəncəvi kimi söz yaradıcılarının Azərbaycan ədəbi mühitinin inkişafında böyük xidmətləri olub.

Səmimi etiraf edək ki, Nizami şeirini dinləyən, onun rübai və qəzəllərini oxuyan, onun əsərlərinə çəkilmiş sənət əsərlərinə tamaşa edən hər kəs özünü sanki sehrli bir dünyada hiss edir. Bu da təsadüfi deyil. Qədim milli-mənəvi dəyərləri, ənənələrini özündə yaşadan Azərbaycan ədəbiyyatı bu gün dünyada müxtəlif sivilizasiyaların qovşağı kimi tanınır. Bu işin prioritet hal almasında Nizami kimi böyük dühaların üzərinə düşən məsuliyyət çox böyükdür. Nə xoş ki, əsrlər keçməsinə baxmayaraq, xalqımız bunu dərindən dərk edir, öz uğurlu fəaliyyətində bunu ardıcıl proqramlarla yerinə yetirir.

Biz hələ on illər əvvəl Nizami Gəncəvinin söz incilərini oxuduqca belə anlayırdıq ki, gələcək zamanlarda tolerantlıq və multukulturalizm sahələri bütün dünyanı əhatə edəcək, bu vacib resurs ölkələr arasında böyük uğurla müşayiət olunacaq. Bu sistemin hazırkı perspektivinin Azərbaycanda hansı səviyyədə olduğu göz qabağındadır və buna nail ola bildiyimiz üçün təbii ki, Nizami ədəbi irsinə minnətdarlıq ifadə etməliyik. Mütəfəkkir şairin istər «Yeddi gözəl» istər "Xeyir və Şər" istərsə də "İsgəndərnamə" əsərlərini dərindən oxusaq, görərik ki, multukulturalizm dəyərləri, onun hazırkı infrastrukturu sivil və təhlükəsiz cəmiyyət reallığından xəbər verir. Səmimi etiraf edək ki, bu prosesin formalaşmasında Nizami inciləri böyük təsiri ilə diqqət mərkəzindədir və hazırda bu, öz effektiv dəyərini ikiqat artırıb.

Ümumiyyətlə, Nizami Gəncəvi yaradıcılığında dövlətçilik amilinə təsir edən vasitələr çoxdur. Ölkəmizin multukulturalizm dəyərləri bu vasitələrdən qaynaq götürür. Taleyüklü məsələlərin həyata keçirilməsi tariximizin bir çox qaranlıq səhifələrini açmaqla kimliyimizi tam müəyyən etməyi, milli kökləri ilə bağlı yeni təfəkkürlü gənc nəsil yetişidirilməsini zəruri edir. Məhz Nizami şeiriyyəti bu qlobal problemi öz əhatəsində çözür və əsrlər sonra yetişəcək mühitlər üçün forma tökür. Bu gün əldə etdiyimiz nailiyyətlərin bir çoxunun forması elə bu ciddi təsirin təfərrüatıdır.

Keçid dövrünün çətinliklərinə, ağır proseslərinə baxmayaraq, biz öz tarixi keçmişimizin çox dəyərli səhifələrini qısa bir müddətdə aça bilmiş və xalqa göstərməyə nail olmuşuq. 880 il bundan əvvəlki ədəbiyyat, Nizami Gəncəvi kimi bir düha yetişdirmiş bir söz xəzinəsi bu tarixi keçmişi, varisi olduğumuz mədəni irsi daha dərindən öyrənmək üçün bizə işıqlı yollar göstərir. Belə deyək, Nizami yaradıcılığında milli inkişafın bitkin nəzəri konsepsiyası, mütərəqqi irəliləyişin Azərbaycan modeli var. Və bu, təkcə ölkəmizdə deyil, bütün bəşər sivilizasiyasında birmənalı təqdir edilir.

Nizami Gəncəfi şeiriyyətini oxduqca bir şeyə tam əmin oluruq ki, siyasi qloballaşmada milli özünüdərkə, adət-ənənə prinsiplərinə, ləyaqət, qürur hisslərinə daha ətraflı və əhatəli yanaşması olan dövlətlər özlərinin dəyər sistemlərini ölkələrarası sivill parlaqlığa sövq edir, müstəqillik, müasirlik kimi siyasi yönlərə daha çox meyl edirlər. Təbii ki, bütün prioritetlərin əsasında qüdrətli inkişaf perspektivləri, düşünülmüş, dünya siyasətinə uyğunlaşdırılmış, balanslaşdırılmış

siyasət, ölkə daxilində sabitliyin təminatı, dövlətçiliyin möhkəmlənməsi və s. durur. Biz bu və bunun kimi önəmli üstünlüklərinə görə Nizami Gəncəvi yaradıcılığını hər zaman uca tuturuq.

Səmimi etiraf edək ki, Nizami Gəncəfi söz inciləri bugünkü Azərbaycan vətəndaşlarının da milli iftixar mənbəyidir, çoxəsaslı, fundamental ədəbi amillərin içərisində möhtəşəm görkəmi ilə seçilir.

Azərbaycan ədəbiyyatının sanballı söz xiridarlarından olan Nizami Gəncəvi haqqında dövrün görkəmli şəxsləri böyük çəkili fikirlər ifadə ediblər. Məsələn, şair, filosof, dövlət xadimi Yohan Volfqanq Höte deyib: "İnsana məhəbbət hissi Nizaminin əsərlərində dahiyanə ifadə olunmuşdur". Tarixşünas, yazıçı-mütəfəkkir, tərcüməçi Abasqulu ağa Bakıxanov bildirib ki, "İnsanın qəlbini təlatümə gətirən Nizami lirikası, dünya şöhrəti qazanan "Xəmsə" şairin mənəvi dünyasına misilsiz nümunədir, öyrənilməsi zəruri olan zəngin bədii xəzinədir. Bütün şairlər onun ustalığını etiraf etmişdir".

Azərbaycan ədəbiyyatşünaslığının banisi, pedaqoq, maarifçi Firudin bəy Köçərli deyib ki, "Şeyx Nizami böyük şairlərdən biri olub. Onun kimi fəcih, rəvantab və şirinzəban şair dünya üzərinə az gəlibdir. Heç bir şair o ləyaqət və zəriflikdə söz deməyibdir".

Müasir dövrümüzün böyük şəxsiyyətləri də Nizami irsinə xüsusi dəyər veriblər. Məsələn, Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev dahi şairin ədəbi dərkini belə mənalandırıb: "Bütün Azərbaycan xalqı Nizami Gəncəvi ilə fəxr edir... O, bu torpaqda yaşayıbdır, bu torpaqda yazıbdır. Onun yazdığı əsərlər bütün dünyada məşhurdur. Təsəvvür edin, 850 il bundan öncə bu qədər böyük əsərlər yaratmaq!.. Bu əsərlər təkcə şeirdən ibarət deyildir, onların hər birində böyük elm var, böyük fəlsəfə var, dahi fikirlər var. Buna görə onun əsərləri də yaşayır, özü də yaşayır".

Bu və bu kimi mənəvi-yüksək, elitar dəyərlər təkcə Nizami Gəncəvi böyüklüyünü özündə ifadə etmir, həm də onun timsalında Azərbaycan ədəbiyyatının sanbalını, bəşər tarixinə verdiyi böyük töhfələri diqqətə çatdırır.

Əslində, dahi şairin bütün əsərləri fəlsəfi quruluşdadır; o, şüurun alt və üst qatlarındakı dərketmə vasitəsilə mümkün sürətli proqramları beyinə yükləyir, fikri qabarmalardakı mürəkkəbliyi öz ağıllı və inandırıcı poetik-elmi izahları ilə əridir. Bu da açıq izah edir ki, onun ədəbi qənaətləri həm unikal, həm də universal miqyasdadır.

Ümumiyyətlə, canlı ədəbi praktikada uğur qazanmaq hər kəsə nəsib olmur. Bu xoşbəxtlik Nizami dərkində bərqərardır.

Bir sözlə, Nizami Gəncəvi Allahın Azərbaycan xalqına bəxşişidir.

## Reference

1. Rasulzadeh M.A. Azerbaijan poet Nizami. Ankara: 1951
2. Babayeva T. Personality problem in Nizami Ganjavi's literary heritage. Baku: 2000
3. Karimly T. Nizami and history. Baku: Science 2002, 241 p.
4. Alibayzadeh E. Nizami and our history. Baku: 2004, 186 p.
5. Rzasoy S. Nizami's poetry: Context of myth-history. Baku: Agridagh, 2003, 212 p.
6. Arzumanly V. Worldwide fame of Nizami Ganjavi. Baku: Kkartal(Eagle), 1997
7. Ahmadov A. Nizami-Science study, Baku: 2001, 254 p.

Göndərilib: 06.07.2021 Qəbul edilib: 17.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/78-83

**Müslim Vahid oğlu Nasiyev**
Azərbaycan Texniki Universiteti
magistrant
mnesiyev@gmail.com

# MÜASİR RABİTƏ SİSTEMLƏRİNƏ ALTERNATİV OLARAQ, PEYK RABİTƏ ŞƏBƏKƏLƏRİNİN ARAŞDIRILMASI VƏ TƏTBİQİ

***Açar sözlər:*** *Peyk, antena, yer orbiti (GEO), transponder, VHF, tezlik modulyasiyası (FM)*

## Research and application of satellite communication networks as an alternative to modern communication systems

**Summary**

Research work has been devoted to show how satellite technology can meet a variety of human needs and the ultimate measure of its effectiveness. Communication satellites, whether in geostationary Earth orbit (GEO) or non GEO, provide an effective platform to relay radio signals between points on the ground. The users who employ these signals enjoy a broad spectrum of telecommunication services on the ground, at sea, and in the air. In recent years, such systems have become practical to the point where a typical household can have its own satellite dish. That dish can receive a broad range of television programming and provide broadband access to the Internet.
***Key words:*** *satellite, antenna, Earth orbit (GEO), transponder, VHF, frequency modulation (FM)*

## Giriş

Peyk rabitə sistemləri, bəzi bazarlarda daha çox yayımlanan yayım mühitləri, o cümlədən efir televiziyası və kabel televiziyası, rəqəmsal abunəçi xətti (DSL) və kabel modemləri kimi yüksək sürətli internet xidmətləri ilə birbaşa rəqabət aparır. Bundan əlavə, peyklər, iki tərəfli səs, məlumat və rəqəmsal səs yayımı kimi mobil xidmətlər ilə istifadəçilərə unikal üstünlüklər təqdim etməyə davam edirlər. 1990-cı illərin sonlarında, internetin və telekomun sürətli inkşafı ilə müşayiət olunan dənizaltı fiber optik kabellərin sürətli formada quraşdırılması, bazarlara mənimsəyə biləcəyindən daha çox tutumlu xidmət göstərdi. Maraqlıdır ki, yeni operatorlar peyklərin köhnəldiyini iddia etsələr belə, peyk rabitəsi qlobal səviyyədə genişlənən onurğa şəbəkələrində artan rol oynamağa davam edir.

Peyk rabitə tətbiqetmələri həm sənaye, həm də əyləncə kimi insan fəaliyyətinin bir çox sahəsində geniş tətbiq olunur. Bir çox iri şirkətlərin rabitə təməlləri, kabel televiziyası, birbaşa yayım peyki (DBS), özəl məlumat şəbəkələri, şifrələnmiş məlumat yayımı, dəniz rabitəsi və uzaqdan izləmə kimi peyk xidmətləri üzərində qurmuşdur. Digərləri üçün, peyklər etibarlı bir rabitə infrastrukturu təmin edərək əvəz olunmaz bir texnologiyaya çevrilmişdir. Stasionar qurğuların praktik olmadığı bölgələrdə peyklər sürətlə tətbiq edilməkdədir. Məsələn, dənizdəki gəmilər artıq İnmarsat peyk sistemi mövcud olduğu üçün Morse kodunu istifadə etmirlər. Uzaq bölgələrdə yaşayan insanlar televiziya proqramlarını qəbul etmək üçün böyük VHF antenna massivlərindən çox, peyk antennalarından istifadə edirlər.

## Peyk şəbəkəsinin əsasları

Hər bir peyk tətbiqi, effektivliyini peyk bağlantısının güclü tərəflərini əsas götürərək əldə edir. Bir peyk, onun hündürlüyü və antenna sisteminin dizaynı ilə müəyyən edilmiş əhatə dairəsi daxilində yerləşən yer stansiyaları üçün mikrodalğalı təkrarlayıcı kimi çıxış edir. Peyklərin fəzadə düzgün paylanması üçün üç əsas orbit konfiqurasiyası təyin olunmuşdur. GEO peyki, qütb bölgələri istisna olmaqla, Yer səthinin təxminən üçdə birini əhatə edə bilər. Buraya dünya əhalisinin və iqtisadi fəaliyyətinin 99% -dən çoxu daxildir.

Aşağı Earth orbit (LEO) və orta Earth orbit (MEO) yanaşmaları daha sonradan yaranmışdır və böyük əhatə səviyyəsinə çatmaq üçün daha çox peyk tələb edir. GEO orbitində olmayan peyklərin yer səthinə nisbətən hərəkət etməsi səbəbiylə, davamlı və fasiləsiz xidmət göstərmək üçün tam bir peyk fəaliyyət göstərməlidir. Yolun uzunluğu, radio siqnallar işıq sürəti ilə hərəkət etdiyi üçün, yayılma gecikməsini meydana gətirir. Bu xüsusiyyət, müxtəlif hündürlüklər üçün orbit dövrü və yayılma gecikməsinin bir sahəsi olan (Şəkil 1.1)-də göstərilmişdir. Xidmətin təbiətindən asılı olaraq, MEO və GEO orbitlərinin artan gecikməsi səbəbindən siqnalın keyfiyyət və iş qabiliyyətində bir qədər deqradasiya ola bilər. Bu xidmətin məqbul olması, maddi təsir dərəcəsi, interaktivlik dərəcəsi, ucdan uca (point to point) sistemin digər komponentlərinin gecikməsi, məlumat ötürülməsini və səhvlərin bərpasını əlaqələndirmək üçün istifadə olunan protokollar kimi bir çox amillərdən asılıdır.




Hazırda üç LEO sistemi xidmətə davam edir: Orbcomm, Iridium və Globalstar. Orbcomm, ikitərəfli mesajlaşma xidməti, Iridium və Globalstar isə mobil telefon üçün nəzərdə tutulmuşdur. Iridiumun-un erkən məhsulları, əl telefonlarından biri ilə dünyanın hər yerində əlaqə qurmağınızı mümkün edirdi. Lakin, Globalstar, öz xidmətinin Iridium'dan daha ucuz olduğunu daha iddialı bir şəkildə iddia etdi. Bu sistemlər xidmət göstərə bilsə də, hamısı investorları üçün maliyyə uğursuzluqları ilə nəticələndi. Hal hazırda, hələ işə başlamayan, GEO olmayan sistem, ICO Communications sistemi əvvəlcə orta dairəvi orbit

üçün nəzərdə tutulmuşdu. Bu sistemin inkişaf etdiriciləri strategiyalarının əl telefonlarına və bu kimi cihazlara xidmət etməkdən asılı olmadığını, əksinə kiçik terminallara genişzolaqlı xidmət göstərmək üçün bir vasitə olduğunu izah edirlər.

VHF diapazonunda olan Orbcomm peykləri xaricində, yeni müzakirə edilən peyklərin hamısı 1-80 GHz tezlik aralığının təyin olunmuş seqmentində işləyən mikrodalğalı təkrarlayıcılara malikdir. Bu peyklərin rabitə kanalında istifadə olunan mikrodalğalar, peyk ilə Yer stansiyaları arasında ötürülən siqnalların görüş xətti boyunca yayılır və məsafənin kvadratına görə artan boşluq itkisi yaşayır. Spektr bölgüsü peyk sənayesində tətbiq olunduğu kimi aşağıdakı təqribi aralıqlarda verilir: L-band: 1.5-1.65 GHz: S-band: 2.4-2.8 GHz; C-band: 3.4-7.0 GHz; X-band: 7.9-9.0 GHz; Ku-band: 10.7-15.0 GHZ Ka-band: 18.0-31.0 GHz; Q-band: 40-50 GHz;V-band: 60-80 GHz.

## Peyk rabitə növlərinin tətbiqi

Peyk rabitəsindəki tətbiqetmələr rəqabətli bazarlara uyğunlaşmaq üçün illər keçdikcə inkişaf etmişdir. Təkamül inkişafı faktoru texnologiyanın təbii bir tərəfidir, çünki peyk rabitəsi son dərəcə çox sahəlidir. Bu faktor, hələ tətbiq olunmayan yeni tətbiqlərə genişləndirilməsi və gələcək peyklərin tərtib olunma strategiyası üçün vacib amillərdən biridir. Birinci tətbiq dəsti, GEO peyklərinin üstünlük təşkil etdiyi, ötürmə rejimini - nöqtədən çox nöqtəyə (point to many point) məlumat paylanmasını izləyir. Əvvəllər siqnallar tezlikli modulyasiya (FM) istifadə edərək orijinal analoq formada ötürülürdü. Bu avadanlıqların bir hissəsi hələ də dünyada istifadə olunarkən, digərləri istifadədən çıxarılır. Bunun əsas səbəblərindən biri, rəqəmsal formada ötürülən siqnalların keyfiyyətini pozmadan nəzərəçarpacaq dərəcədə sıxa bilmək və rabitə yolu üzərində təkrarlayıcılardan (repeater-lar) istifadə etməklə daha uzaq məsafələrə itikisiz məlumatı ötürə bilməkdir. Ənənəvi peyk tətbiqlərində, yuxarı ötürmə kanalı (ötürücü moduldan gələn) ilə geri ötürmə kanalının (yerüstü stansiyanın) istifadə etdiyi bant genişliyinin təqribi müqayisəsi, Şəkil 1.2-də göstərilmişdir. Şəkildə həmçinin, geniş yayılmış VSAT sistemlərin, faylları və digər media vasitələrini ötürən cihazların və TV-Mobil rabitə sistemlərinin, ötürmə kanalından istifadə dəyərləri əks olunub.



Rabitə sistemlərində, 10-dan 20-yə qədər bir bant genişliyi olan sıxılma faktoru geniş yayılmışdır. Bunun əsas faydası ötürmə kanalı başına transponder tutumunu azaltmaq və bununla da faydalı məlumat tutumunu artırmaqdır. Beləliklə, transponderin dəyəri olaraq bir televiziya kanalı üçün ildə 1,5 milyon dollar ödəmək əvəzinə, xərclər, 250000 dollara və ya daha aza endirilir. Bu səbəbdən, analoq tipli avadanlığının düşmə dəyəri sıfır olsa belə istismarı bahalı olmuşdur. Məlumat rəqəmsal formada olduqda, çox müxtəlif tərzdə və formalarda idarə oluna bilər. Nəticədə bit axını, istifadəçilərin alt qruplarına və ya hətta fərdi bir istifadəçiyə ünvanlanan fərqli məzmunu daxil etmək üçün genişləndirilə bilər. Rəqəmsal televiziya kanallarını ötürmək üçün indiki peyk istifadəsinə əlavə olaraq rəqəmsal məzmun paylanmasında yeni tətbiqlərin meydana çıxdığını və inkişaf etdiyini görürük. Bu yeni tətbiqetmələrdə, veb gəzməyə (web surfing) icazə vermək baxımından internetin xüsusiyyətləri istifadə edilə bilər. Bununla birlikdə, multicast texnikasından istifadə etməklə, GEO peykləri platformasında, internet üzərindən daha az gecikməyə malik və sürətli və etbarlı TCP-İP rabitələri təmin etmək mümkündür.

### Peyklər üzərindən məlumat mübadiləsi və İnternet

Peyk şəbəkələri, xeyriyyə təşkilatları və dini qrupları əhatə edən müəssisələrin, dövlət qurumlarının və qeyri-hökumət təşkilatlarının (QHT) müxtəlif məlumat rabitə ehtiyaclarını ödəməyə qadirdir. Geniş sahə əhatə etmə xüsusiyyəti, xidmətin daimi olaraq stabil səviyyədə olması ilə nisbətən geniş bant genişliyi və ötürmə qabiliyyəti ilə birlikdə peyk rabitəsi, inkişaf etməkdə olan ölkələrdə və coğrafi olaraq daha böyük inkişaf etmiş ölkələrdə və bölgələrdə geniş tətbiq olunur. Üstəlik, nöqtədən çox nöqtəyə xüsusiyyəti, GEO peyklərini veb səhifələr və filmlər kimi, IP əsaslı multimediya məzmununun paylanması üçün yer üstü internet kanallarından üstün edir. Dünyadakı C və Ku bantlarının məşhur istifadəçiləri olan 36 MHz standartlı transponderlər, geniş zolaqlı tətbiqetmələr və multimediya üçün uyğun olan 80 Mbps-ə qədər ötürmə sürətini təmin edə bilir. Əslində, peykdə istifadə olunan çoxsaylı giriş texnikası, yerüstü bağlantılar üzərindəki simsiz şəbəkələrdə, lokal şəbəkələrdə (LAN) və geniş ərazi şəbəkələrində (WAN) istifadə olunan yanaşmaları əks etdirir. VSAT sistemlərdən istifadə edən peyk şəbəkələri, fiber optik və mikrodalğalı radio kanallardan ibarət olan yerüstü şəbəkələrə alternativ hesab olunur. Hətta VSAT-larla yerüstü şəbəkələrin müxtəlif formaları arasında uyğunluqlar mövcuddur, çünki hər ikisi, şəbəkə üçün nəzərdə tutulmuş standart protokollardan (TCP-İP kimi) istifadə edirlər.

VSAT sistemlərin ən uğurlu istifadəçilərindən biri Şimali Amerikanın istehlak bazarlarında tanış adlardır. Avropada, Latın Amerikasında və Çində satış nöqtələri açan ABŞ-ın ən böyük mağaza şəbəkəsi olan Wal-Mart, bu texnologiyanı erkən mənimsəmiş və rəqiblərini VSAT-ları meqamarketlərin qabaqcıl texnologiyası kimi istifadə etməyə məcbur etmişdir. Arkanzas qərargahındakı yerüstü stansiya mərkəzi ilə Wal-Mart, kredit icazəsi və inventar idarəetmə funksiyalarını mərkəzləşdirir. Chevron Oil, ilk növbədə benzin pərakəndə satış şirkətləri arasında, müştəri xidmətini sürətləndirmək, saxtakarlığın qarşısını almaq və alış tendensiyalarını sistem daxilində aydın bir şəkildə başa düşmək üçün VSAT-ları şirkətə məxsus bütün yanacaq doldurma məntəqələrində quraşdırmışdı.

Müasir müştəri-server hesablama şəbəkələri və ya genişzolaqlı multimediya istifadə edən istənilən İT tətbiqi, müxtəlif yerlər və istifadəçilər arasında məlumatların səmərəli ötürülməsini tələb edir. Peyk rabitəsi nisbətən böyük bir yayılma gecikməsini təqdim edir,

lakin bu məlumatın cavab müddəti üçün mövcud amillərdən yalnız biridir. Cavab vaxtına təsir edən çox sayda amil var: giriş məlumatlarının sürəti (saniyədə bitlərlə), rabitə kanalı vasitəsilə yayılma gecikməsi, məlumatın rabitə avadanlıqlarında işləmə və növbə gecikməsi və yerüstü məlumat xətti və ya kompüteri təşkil edən elementləri ilə bağlı hər hansı bir nasazlıq. Transmission Control Protocol / Internet Protocol (TCP/IP) və Systems Network Architecture / Synchronous Data Link Control (SNA/SDLC) kimi müasir məlumat rabitə standartları, məlumat mübadiləsi zamanı alıcı tərəfindən səhvlər aşkar edildikdə, məlumat bloklarının təkrar ötürülməsini tələb etməklə informasiya itkisindən qorunurlar. Bu sistemlərdə, məhsuldarlığı optimallaşdırmaq üçün dövrənin gecikmə, məlumatın növü, səhv dərəcəsi və nəticədə protokol və tətbiqetmə performansını yoxlamaq və tənzimləmək lazımdır. Hələ də, VSAT şəbəkə avadanlığı və proqram təminatçıları, bir GEO peyk əlaqəsinin gecikməsini kompensasiya etmək üçün protokolların sürətləndirməsini vacib bilirlər. Ənənəvi VSAT sistemlərin strukturu, Şəkil 1.3-də göstərilmişdir. Yerüstü və peyk əlaqələrini müqayisə edərkən bu xüsusiyyətlərin hər biri diqqətlə nəzərdən keçirilməlidir.




## Nəticə

Peyk əlaqələri, İnternetin onurğa sütununun bir hissəsi olaraq əhəmiyyətli bir mövqeyi tutur. Peyk rabitəsi, inkişaf etməkdə olan ölkələrdə və ikinci dərəcəli şəhərlərdə, ABŞ, Avropa, Yaponiya və digər populyar giriş nöqtələrindəki əsas qovşaqlara bağlanmaq üçün keçid rolunu oynayır. Keçidlər, gözlənilən tələbdən və ISP-nin maliyyə qabiliyyətindən asılı olaraq, 256 Kbps ilə 155 Mbps arasında olan sürətlərdə ikitərəfli məlumat ötürülməsini təmin edir. Ümumiyyətlə, uzun müddətli və uzaq məsafəli məlumat mübadiləsi üçün, sabit yerüstü stansiyalar və GEO peykləri arasında nöqtədən-nöqtəyə əlaqələrinin qurulması səmərəli üsul hesab olunur. Hazırda, dünyanın peyk sistemləri 2 Mbps və ya daha yüksək məlumat ötürülməsinə icazə vermək üçün kifayət qədər keyfiyyətli bağlantı qurmağa qadirdirlər. Burada əsas meyarlar, xidmətin maliyyə baxımından cəlbedici olub olmaması və istehlakçı səviyyəsində olan DSL və ya kabel modem xidmətlərinin mövcudluğudur. VSAT şəbəkələrindən istifadə edərək təqdim olunan xidmətlər, təyinatına görə xüsusi tətbiqetmələr və müvəqqəti xidmət tələb olunduqda da istifadə edilə bilər.

## References

1. The Satellite Communication Applications Handbook, Second Edition, Bruce R. Elbert, p. 552
2. Low Earth Orbital Satellites for Personal Communication Networks, Abbas Jamalipour p. 273

3. The Satellite Communication Ground Segment and Earth Station Handbook, Bruce R. Elbert p. 388
4. Understanding GPS, Elliott D. Kaplan, p. 726
5. Spacecraft Systems Engineering 4th Edition p. 724
6. Satellite Communications Payload and System 1st Edition p. 400
7. FM Satellite Communications for Beginners: Shoot for the Sky... On A Budget (Amateur Radio for Beginners Book 7) Kindle Edition p. 64
8. Microwave Radio Antenna Link Fundamentals [SP6105] training materials
9. SAILOR 800 & 900 VSAT Technical manual p. 418
10. Cobham SATCOM Basic Satellite Training materials

**Rəyçi: dos.Z.Cəfərov**

Göndərilib: 09.07.2021 Qəbul edilib: 18.07.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/68/84-89

**Ülvi Famil oğlu Əsədullayev**
Bakı, Azərbaycan
magistr
Ulvi.asadullayev@yahoo.com

# BEYNƏLXALQ FƏRDİ ÖHDƏLİKLƏR VƏ FƏRDLƏRİN BEYNƏLXALQ MƏSULİYYƏTİ

***Açar sözlər:*** *Beynəlxalq fərdi öhdəliklər, hüquqi sanksiyalar, BMT Nizamnaməsi, hüquqi məsuliyyət, beynəlxalq hərbu tribunal*

## International individual obligations and international responsibilities of individuals

**Summary**

Depending on the state, an individual may not have the procedural capacity to appeal to the Court, but as a result of changes in the international community, they have gained the right to sue in international courts. This development is a factor that will be taken into account in all research on the international subjectivity of the individual.

***Key words:*** *International individual obligations, legal sanctions, UN Charter, legal responsibility, international military tribunal*

## Giriş

Beynəlxalq hüquqi münasibətlərdə çıxış edən subyektin öz əxlaqı və hərəkətinə məsuliyyəti, müvafiq beynəlxalq hüquqi sanksiyalar sistemi nəzərdə tutulmadan nə dövlətin daxilində, nə də beynəlxalq münasibətlər sahəsində heç bir müvəffəqiyyət əldə edilə bilməz.

BMT Nizamnaməsinə əsasən dövlətlər arasında dostluq münasibətlərinə, əməkdaşlığa aid olan beynəlxalq hüquqi prinsiplər haqqında 1970-ci il Bəyannaməsi, 1975-ci ildəki və s. aktlar kimi mühüm sənədlər beynəlxalq prinsiplərin vicdanla yerinə yetirilməsini tələb edir.

Sülh, təhlükəsizlik, əməkdaşlıq naminə beynəlxalq hüququn inkişafının indiki mərhələsində ümumi prinsiplərin ciddi gözlənilməsi çox vacibdir və beynəlxalq hüquqi məsuliyyət məsələlərini tənzim edən norma və qaydaların dəqiq, konkret və qəti surətdə müəyyən edilməsinə böyük ehtiyac vardır (8, s.45).

Beynəlxalq hüquqi məsuliyyət dedikdə, beynəlxalq hüquqi pozğunluq və ya beynəlxalq cinayət əməli nəticəsində müəyyən dövlətin və ya digər subyektin üzərinə düşən siyasi-mənəvi və maddi hüquqi nəticələrinin məcmuu başa düşülür.

Məlumdur ki, dövlət daxilində hüququn (qanunların, normaların) pozulması müəyyən məsuliyyətə səbəb olur. Beynəlxalq hüququn pozulmasının və bundan irəli gələn məsuliyyətin formalarının öz xüsusiyyətləri mövcuddur. Beynəlxalq münasibətlərdə hər hansı bir dövlətin dövlət iradəsi, öz ifadəsini həmin dövlətin müvafiq orqanlarının fəaliyyətində axtarılır. Beynəlxalq cinayət dedikdə dövlətlərin və millətlərin öz varlığına qorxu yaradan, xalqlar arasında təhlükəsizlik, sülh və dostluq münasibətlərinə qarşı yönəldilən ən ağır hüquqa zidd hərəkət, yaxud hərəkətsizlik başa düşülür. Tarixdə belə hallar Hitlerin yəhudiləri qırması, II dünya müharibəsindəki hərəkətləri, bizim üçün isə ermənilərin dəfələrlə, xüsusən 1988-ci ildən heç bir beynəlxalq hüquqa məhəl qoymadan etnik təmizləmə, soyqırımı fəaliyyəti göstərməsidir.

**Beynəlxalq hüquqa əsasən,** dövlət öz orqanlarının və vəzifəli şəxslərini habelə vətəndaşlarının törətdikləri bütün hüquqa zidd cinayət əməlləri üstündə məsuliyyət daşıyır. Hər bir dövlət öz ərazisində başqa dövlətin və onun vətəndaşlarının hüququnun pozulması üçün də məsuliyyət daşıyır. Bütün dövlət öz ərazisində başçılıq edərkən, orada baş verən bütün hərəkətlərə nəzarət etməlidir ki, bu da dövlət suvereniteti prinsipindən irəli gəlir. Bu prinsip BMT Baş Məclisinin 7 dekabr 1953-cü il tarixli sessiyasında öz hüquqi statusunu almışdır (7, s.97).

Hərbi cinayətlər, təcavüzkarlıq üstündə məsuliyyət məsələləri II dünya müharibəsindən sonra daha geniş vüsət alıb. Dövlət səviyyəsində bu prinsiplər Alman və Yapon hərbi canilərini mühakimə etmək üçün Nyürenberq, Tokio Beynəlxalq hərbi tribunallarının nizamnaməsində daha dəqiq təsdiq olunub. Nyürenberq hərbi tribunalının hökmü əməli surətdə həyata keçirilərək, BMT Baş Məclisinin 1946-ci il 11 dekabr və 21 noyabr tarixli qətnamələri ilə həyata keçirilib.

Beləliklə, BMT-nin də təsdiq etdiyi Beynəlxalq hərbi tribunallarının prinsipləri daha da qanuniləşdirilmiş olur. Həmin prinsiplər indi təcavüzkarlığ və hərbi cinayətlərə qarşı mübarizəni ümumtanınmış beynəlxalq hüquqi prinsiplərini təşkil edir. Yəqin ki, vaxt gələcək Ermənistan dövləti, onun ayrı-ayrı rəhbərləri azərbaycan türklərinə qarşı apardıqları təcavüzkarlıq, zorakılıq, soyqırımı, işğal və s. cinayətləri üçün cavab verməli olacaqlar (1, s.34).

Təcavüzkarlıq müharibəsinin planlaşdırılması, hazırlanması, qızışdırılması, aparılması, hərbi cinayətlər (hərbi əsirlərin öldürülməsi və onlara işgəncə verilməsi, girov alınmış insanların öldürülməsi, qəsdən şəhər və kəndlərin dağılması və s.), insanlığa qarşı cinayətlər (dinc əhalinin öldürülməsi, məhv edilməsi, əsarət altına alınması və ya onlara qarşı tədbiq olunan digər qəddarlıq, habelə siyasi, irqi və dini əlamətlərə görə təqib edilməsi, köçürülməsi, soyqırımı aparılması və i.a) anlayışları müəyyən edilmişdir. Bütün bu cinayətlər hazırda ümumi başlıq altında bəşəriyyətə qarşı cinayət hesab edilir və BMT Baş Məclisinin XX-XX-II sessiyalarında qəbul olunub. Genosid məsələsi 1948-ci il, irqi-dini ayrıseçkiliyi isə 1966-1968-ci il sazişlərində daha ciddi qoyulmuşdur.

Beynəlxalq hüquqi təcrübədə dövlətin qanunvericilik, icra və məhkəmə orqanlarının hüquqa zidd hərəkət və hərəkətsizliyi ilə əlaqədar məsələlərə daha çox rast olunur. Dövlətin beynəlxalq hüququn ümumtanınmış əsas prinsiplərinə zidd olan qanunları, dekretləri, bəyannamə və digər aktları, xüsusilə təcavüzkarlığa yönəldilən, habelə digər beynəlxalq cinayətin törədilməsi bilavasitə əlaqədar olan rəsmi aktları və sərəncamları da beynəlxalq hüquqi məsuliyyət üçün əsas hesab etmək olar. Əlbətdə, qanunvericilik fəaliyyəti üstündə dövlətin məsuliyyəti, müvafiq sənədlərin verilməsi ilə deyil, onların bilavasitə icrası və həyata keçirilməsi ilə əlaqədar olur. Təcavüzkar dövlət öz orqanlarının (silahlı qüvvələr, polis, gömrük və s.) və vəzifəli şəxslərinin hüquqa zidd əməlləri üstündə düzünə və ya dolayısı ilə məsuliyyət daşıyırlar (6, s.87).

Beynəlxalq hüquqa əsasən, dövlət ərazisi daxilində öz orqanlarının və vəzifəli şəxslərinin, habelə vətəndaşlarının törətdikləri beynəlxalq qanunsuzluğa və cinayətə səbəb ola bilən bütün hüquqa zidd əməllər üstündə məsuliyyət daşıyır. Əgər, dünya dövlətlərinin özünün cinayət məcəlləsində xarici dövlət nümayəndəsi əleyhinə terror aktı, müharibə təbliğatı, hərbi soyğunluq, hərbi əməliyyat rayonunda əhaliyə qarşı zorakılıq etmək, onun əmlakını qanunsuz almaq, hərbi əsirlərlə pis rəftar etmək, Qırmızı Aypara və Qırmızı nişanlarını qanunsuz olaraq taxmaq və bunlardan sui istifadə etmək və s. cinayət əməlləri üstündə ciddi cəzalar müəyyən olunub. Amma, biz özümüz şahidik ki, ermənilər öz aidiyyatı orqanlarının sənədlərində belə maddələrdən istifadə etsələr də əsl həqiqətdəAzərbaycana qarşı bir çox cinayətlər törətmişlər və bu əsla birinci dəfə deyildir. Beynəlxalq aləmdə dövlətin beynəlxalq hüququ məsuliyyəti

formaları çoxdur və onun hüquqa zidd fəaliyyət və ya fəaliyyətsizliyi nəticəsində törədilən beynəlxalq delikt və ya beynəlxalq cinayətlə əlaqədar müəyyən olunur. (9, s.34)

Ciddi beynəlxalq cinayətdə təqsiri olan dövlətin, həmin cinayət nəticəsində dəyən ziyanı ödəmək öhdəliyi ilə yanaşı, həm də siyasi məsuliyyəti tələb olunur. Məsuliyyət həm fərdi, həm də kollektiv tədbirlərdən ibarət ola bilər. Cinayət nəticəsində zərər çəkmiş dövlət qarşı dövlət barəsində fərdi olaraq repressiyaya və retorsiyaya, əyani onun hüquqa uyğun və ya hüquqa zidd hərəkətlərinə qarşı oxşar cavab tədbirlərinə əl ata bilər.

Maddi məsuliyyətdə isə dəymiş ziyanı ödəmək (pulla), dəymiş ziyanı natura ilə ödəmək (dağıdılmış obyektlərin bərpa edilməsi, aparılan əmlakın geri qaytarılması və s.) ödəməyin, məhv (xarab edilmiş) və ya qarət edilib aparılmış əmlakın əvəzinə yeni əmlak verilməsini nəzərdə tutur.

Beynəlxalq hüquqda hərbi canilərin cinayət məsuliyyəti bir mənalı olur və bəşəriyyətə qarşı ağır cinayət törətməkdə təqsirləndirilən şəxslər cinayət məsuliyyətinə alınmalıdırlar. Buna misal olaraq SSRİ Ali Sovetinin 1942-ci il 2 noyabr tarixli fərmanı ilə faşist işğalçıları tərəfindən vətəndaşlara, kolxozlara, ictimai təşkilatlara, dövlət müəssisələrinə dəymiş zərəri müəyyənləşdirmək üçün fövqəladə dövlət komisiyası təsis etmişdir. Hitlerçilərin törəkdikləri vəhşiliklərə görə 1943-cü il 2 noyabrda Moskvada SSRİ, ABŞ və Böyük Britaniya dövlətləri arasında xüsusi bəyannamə, 1945-ci ilin Krım konfransında isə bütün müharibə canilərinin ciddi cəzalandırılması qərara alınmışdır.

1945-ci il avqustun 8-də isə Londanda ABŞ, SSRİ, Fransa, Böyük Britaniya dövlətləri nümayəndələri Avropa dövlətlərinin əsas canilərinin məsuliyyətə cəlb edilməsi və onların cəzalandırılması haqqında xüsusi sazişə gəlmişlər. Buna əsasən, beynəlxalq məhkəmə hesab olunan Nyürenberq Beynəlxalq Hərbi Tribunalı təsis edildi və onun Nizamnaməsi də qəbul edilib həmin sazişə əlavə olundu. Bu Nizamnamə əsasında Beynəlxalq Hərbi Tribunalın aidiyyatına sülhə qarşı cinayətlər (təcavüz müharibəsinin hazırlanması, qızışdırılması, aparılması), insanlığa qarşı cinayətlər (insanların öldürülməsi, əsarət, sürgün, onlara əzab verilməsi və s. qəddarlıq hərəkətləri), hərbi cinayətlər (müharibə, qanun və ədalətlərinin pozulması) daxildir (2, s.56).

İndi isə müxtəlif vaxtlarda yaradılmış tribunalların fəaliyyətinə nəzər salaq. Beynəlxalq cinayətlər törətmiş fiziki şəxslərin cinayət məsuliyyətinə cəlb olunmasında və mühakimə olunmasında milli məhkəmələr əhəmiyyətli rol oynaya bilər və əslində oynamalıdır. Bir sıra ölkələrin (Almaniya, ABŞ, Fransa, İsrail və b.) məhkəmə orqanlan, xüsusilə İkinci Dünya müharibəsi dövründə törədilmiş beynəlxalq cinayətlərlə bağlı xeyli sayda əhəmiyyətli hökmlər çıxarmışdır. Göstərilən hüquq və vəzifəni adekvat həyata keçirmək üçün hər bir dövlət öz milli qanunvericiliyində maddi və prosessual hüquqi mexanizmlər nəzərdə tutmalıdır. Hər şeydən əvvəl bu o deməkdir ki, dövlət müvafiq beynəlxalq sazişlərin tələblərindən irəli gələrək, beynəlxalq cinayət tərkiblərini öz cinayət qanunvericiliyinə daxil etməlidir (6, s.145).

Lakin beynəlxalq cinayət yurisdiksiyasının həyata keçirilməsi üçün ən optimal mexanizm daimi fəaliyyət göstərən beynəlxalq cinayət məhkəməsidir. Belə bir məhkəmə, nəhayət ki, 2003-cü ildən fəaliyyətə başlamışdır. Bununla yanaşı, konkret tarixi şəraitdə və konkret məkanda baş vermiş hadisələri araşdırmaq və ağır cinayətlər törətmiş şəxsləri mühakimə etmək məqsədi ilə ad hoc əsasda beynəlxalq tribunallar təsis olunmuşdur. Bunlar İkinci Dünya müharibəsindən sonra yaradılmış Nürnberq və Tokio tribunalları və müvafiq olaraq 1993-cü və 1994-cü illərdə yaradılmış Yuqoslaviya və Ruanda tribunallarıdır. Son iki tribunal, «qalib dövlətlər» tərəfindən yaradılan Nümberq və Tokio tribunallanndan fərqli olaraq, birinci dəfə olaraq beynəlxalq təşkilatın qərarı, daha doğrusu, BMT Təhlükəsizlik Şurasının müvafiq qətnamələri əsasında yaradılmışdır.

Nürnberq və Tokio tribunalları - bu iki tribunal beynəlxalq cinayətlər törətmiş şəxsləri mühakimə etmək üçün təsis olunmuş ilk beynəlxalq məhkəmə orqanları idi. Onlar İkinci Dünya müharibəsi illərində törədilmiş misilsiz vəhşiliklərə cavab olaraq qalib dövlətlər tərəfindən yaradılmışdı. Nümberq tribunalı ABŞ, Böyük Britaniya, SSRİ vo Fransa arasında 1945-ci ildə bağlanmış Sazişdə nəzərdə tutulmuşdu. Sonralar daha 19 dövlətin qoşulduğu bu Sazişə Beynəlxalq hərbi tribunalın Nizamnaməsi əlavə olunmuşdu.

Uzaq Şərq üçün Beynəlxalq hərbi tribunal 11 dövlət (ABŞ, Böyük Britaniya, SSRİ, Fransa, Çin, Avstraliya, Yeni Zelandiya, Kanada, Niderland, Filippin və Hindistan) arasında 1946-cı ildə imzalanmış Sazişə müvafiq olaraq təsis olunmuşdu. Yaponiya militarist siyasətinin aparıcı fiqurlarını cəzalandırmaq məqsədi daşıyan bu Tribunal Nümberq tribunalının, prinsip etibarilə, eyni idi. Nümberq tribunalının yurisdiksiyasma sülh əleyhinə cinayətlər, müharibə cinayətləri və insanlıq əleyhinə cinayətlər aid edilmişdi. Bu Tribunalın Nizamnaməsi və çıxardığı hökmlər beynəlxalq cinayət hüququnun inkişafına əhəmiyyətli təkan vermişdir. Bir sıra Nümberq prinsipləri sonralar beynəlxalq adət hüququna daxil olmuşdur; məsələn, müttəhimin dövlət başçısı və ya digər məsul vəzifəli şəxs olması onu göstərilən cinayətlərə görə məsuliyyətdən azad etmir; cinayətin yuxarı vəzifəli şəxsin və ya hərbi komandirin əmrinə əsasən törədilməsi tabeçilikdə olan şəxsi məsuliyyətdən azad etmir, lakin yüngülləşdirici hal kimi çıxış edə bilər və s. Nümberq tribunalı nəinki fiziki şəxslərin, habelə təşkilatların da cinayət məsuliyyəti barədə məsələ qaldırmışdı. Tribunal 12 nəfəri ölüm cəzasına, 7 nəfəri azadlıqdan məhrum etmə cəzasına məhkum etmiş, 3 nəfərə isə bəraət vermişdi (3, s.234).

*Yuqoslaviya tribunalı* 1993-cü ildə BMT Təhlükəsizlik Şurasının 1993-cü il 23 fevral tarixli 808 nömrəli və 1993-cü il 25 may tarixli 827 nömrəli qətnamələri əsasında yaradılmışdır. Tribunal öz Nizamnaməsi əsasında fəaliyyət göstərir. Nizamnamədə aşağıdakı cinayət tərkibləri göstərilmişdir: Müharibə qurbanlannm müdafiəsi haqqında 1949-cu il Cenevrə Konvensiyalannm ciddi pozuntuları; müharibə qanun və adətlərinin pozulması (bu, əsasən, beynəlxalq humanitar hüququn «Haaqa hüququ» adlanan hissəsinin ciddi pozuntularını əhatə edir; soyqınm və insanlıq əleyhinə cinayətlər. 6-cı maddəyə əsasən. Tribunal yalnız fiziki şəxslər üzərində yurisdiksiyaya malikdir (hüquqi şəxslər buraya daxil edilmir). Tribunal aşağıdakı orqanlardan ibarətdir:

1) iki birinci instansiya palatası və Apellyasiya palatası;
2) Prokuror;
3) Dəftərxana (o, 220 həm palatalara, həm də Prokurora xidmət edir).

Nizamnəmədə, bunlardan əlavə, aşağıdakı məsələlər öz əksini tapmışdır:

- ibtidai istintaq və ittihamnamənin tərkibi; məhkəmə baxışı;
- müttəhimlərin hüquqları, zərərçəkənlərin və şahidlərin müdafiəsi;
- hökm və cəza məsələləri;
- apellyasiya və təzə faktların aşkara çıxarılması ilə hökmə yenidən baxılması;
- hökmün icrası;
- əfv və hökmlərin əvəz olunması;
- əməkdaşlıq və hüquqi yardım;
- Tribunalın imtiyaz və immunitetləri;
- Tribunalın xərcləri və s.

Yuqoslaviya tribunalının olduğu yer Niderlandm Haaqa şəhəridir. Fəaliyyətə başladığı andan bu günə qədər Yuqoslaviya tribunalı 100-dən artıq şəxs barəsində prosesi başa çatdırmışdır. Tribunal tarixdə ilk dəfə olaraq fəaliyyətdə olan dövlət başçısı - Slobodan Miloşeviç barəsində hakimiyyətdə olduğu dövrdə törətdiyi cinayətlərə görə ittiham irəli sürmüşdür. Tribunal beynəlxalq cinayət hüququnun inkişafına mühüm töhfə vermişdir. O, müharibə cinayətlərinin

